**Kitabı tərtib etdilər:**
Şahin Aydəmir,
Osman Məmmədov,
İlkin İbrahimxəlilov

**Redaktor:**
**Şahnaz Salamova**
*Pedaqogika üzrə fəlsəfə doktoru*

*"Göynük qartalları İkinci Qarabağ müharibəsində" kitabı Şəki rayonunun Göynük bölgəsinin Vətən müharibəsində iştirak edərək qəhrəmanlıqlar göstərmiş gənc övladlarından bəhs edir. Kitabı çapa hazırlayan Şahin Aydəmirin, Osman Məmmədovun və gənc yazar İlkin İbrahimxəlilovun həyata keçirdikləri bu layihə böyük önəm daşıyır. Gələcək nəsillərin vətənpərvərlik ruhunda tərbiyə olunmasnda bu qəbildən olan kitablar böyük rol oynayacaqdır.*

**İSBN 978-9952-37-060-7**


Əlavə və düzəlişlər edilmiş, təkrar çap.

## 44 GÜNLÜK MÜHARİBƏ HƏRB TARİXİMİZİN ZƏFƏR ZİRVƏSİDİR

Azərbaycan xalqı tarixboyu mənfur düşmənlərə qarşı döyüşlərdə saysız-hesabsız qurbanlar verib və bu yolda qələbə, zəfər dolu sevinc anlarımız da, məğlubiyyətdən üzüldüyümüz hallar da olub. Amma heç vaxt məğlubiyyət xalqımızı ruhdan salmayıb, əksinə, qisas ruhu bizi yeni qələbələrə ruhlandırıb. Bu baxımdan ötən ilin sentyabr ayının 27-də erməni işğalçılarına qarşı başlayan və 44 gün davam edən İkinci Qarabağ müharibəsində qazandığımız zəfər hərb tariximizə qızıl hərflərlə yazılacaq.

Qürurla, sevinclə qeyd edim ki, Azərbaycan Ordusunun sentyabrın 27-də işğalçı Ermənistan silahlı qüvvələrinə qarşı başladığı əks-hücum əməliyyatında əldə etdiyi möhtəşəm qələbələr haqqında bundan sonra çoxlu sayda kitablar yazılacaq, filmlər çəkiləcək. Amma indidən tam əminliklə deyə bilərik ki, cəbhədə qazandığımız uğurlarımızın səbəbkarı Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevdir. Onun son 17 ildə həyata keçirdiyi güclü dövlət, güclü ordu strategiyası, milli birlik və döyüşçülərimizin ruh yüksəkli-

yi Zəfərimizin təminatçısı oldu. Necə deyərlər, xalqımız bu qələbəni illərlə gözləyirdi və uşaqdan tutmuş bu gün sabah-dünyasını dəyişəcək yaşlı insanlara qədər mənfur düşmən üzərində qələbəyə susamışdı və hamı da zəfər anını, onun gələcəyi günü gözləyirdi.

Birinci Qarabağ savaşında Rusiyanın hərbi yardımı ilə ərazilərimizin 20 faizini işğal edən və 27 il ərzində torpaqlarımızı işğal altında saxlayıb şəhərlərimizi, kəndlərimizi çapıb-talayaraq viran qoyan erməni faşistlərindən intiqam almaq isə hamımızın müqəddəs arzusu idi. Azərbaycan ordusu hər an düşməni məhv etməyə hazır olduğunu isə 2016-cı ilin aprelində baş verən 4 günlük müharibədə bir daha təsdiq etdi. O vaxt düşmənə ağır zərbələr vuraraq 4 gün ərzində kifayət qədər böyük əraziləri azad edən ordumuzun zəfər yürüşünə Rusiya, daha dəqiq desək adı çəkilən ölkənin erməni əsilli Xarici İşlər naziri Segey Lavrov mane oldu. Sergey Lavrovun səyləri nəticəsində Ermənistan ordusu məğlubiyyətdən xilas ola bildi. Rusiya müharibəni dayandırmasının əvəzində Azərbaycana qısa müddətdə Dağlıq Qarabağ ətrafında işğal altında olan rayonlarımızı azad etməyə söz verdi. Lakin Rusiya tarixboyu olduğu kimi öz vədinə əməl etmədi və yenidən danışıqlar pərdəsi altında vaxtudma siyasətini davam etdirdi. Lakin mənfur düşmənlər və onları himayə edənlər yanılmışdılar.

Azərbaycan xalqı qələbəyə susamışdı və ordumuz Ali Baş Komandan İlham Əliyevin əmri ilə hər an torpaqlarımızı işğaldan azad etməyə hazır idi. Ötən müddət ərzində ordumuz ən müasir silahlarla- dronlarla, pilotsuz uçan aparatlarla (PUA) və digər hərbi texnika ilə təchiz edilmişdi. Bu baxımdan ötən ilin iyul ayında Tovuz istiqamətində hücuma cəhd

edən düşmənə vurulan ağır zərbələr də qələbə gününün uzaqda olmadığnı bir daha sübut etdi. Amma ağır məğlubiyyətə uğrayan düşmən yenə də təxribatları davam etdirərək yeni ərazilərimizi işğal edəcəyinə ümid edirdi.

Ermənistanın Baş naziri Nikol Paşinyan və onun komandası cəbhə xəttində hücuma hazırlaşırdı. O dövrdə Ermənistan Müdafiə naziri David Tonoyan bəyan etmişdi ki, biz müharibə başlayacağı təqdirdə yeni ərazilər işğal edəcəyik. Necə deyərlər hər iki tərəf müharibəyə hazırlaşırdı. Rusiyaya gəlincə Moskvada Qərbə meyilli Paşinyana dərs vermək və onu müharibə yolu ilə hakimiyyəydən uzaqlaşdırmaq niyyətində idilər. Hələ müharibə başlamağa bir neçə ay qalmış Rusiya özünün tanınmış hərbi ekspertləri vasitəsi ilə müharibə başlayacağı təqdirdə Moskvanın “neytral” qalacağı barədə siqnal ötürmüşdü.

Hadisələrin gedişi göstərdi ki, Moskva müharibədə ordumuzun çox da böyük ərazilər azad edəcəyinə və düşmənin möhkəmləndirilmiş müdafiə xəttini yara biləcəyinə inanmırdı. Amma onlar da yanılmışdılar. 2020-ci il sentyabr ayının 27-də düşmən ordumuzun mövqelərinə raket və artilleriya zərbələri endirərək hücuma keçməyə cəhd etdi. Lakin ordumuz dərhal düşmənə ağər zərbələr endirərək əks-hücuma keçdi.

Ordumuzun sentyabrın 27-də Qarabağda başladığı uğurlu əks-həmlə əməliyyatları nəticəsində noyabrın 9-dək 5 şəhər, 4 qəsəbə və 286 kənd işğaldan azad edildi. Cəbrayıl şəhəri və rayonun 90 kəndi, Füzuli şəhəri və rayonun 53 kəndi, Zəngilan şəhəri, rayonun Mincivan, Ağbənd, Bartaz qəsəbələri, Sığırt, Şükürataz və 5 adsız yüksəklik və 52 kəndi, Xocavənd rayonunun Hadrut qəsəbəsi və 35 kəndi, Tərtər rayonunun 3

kəndi, Qubadlı şəhəri və rayonun 41 kəndi, Xocalı rayonunun 9 kəndi, Şuşa şəhəri, Laçın rayonunun 3 kəndi, həmçinin Ağdərə və Murovdağ istiqamətlərində bir neçə strateji yüksəklik yağılardan təmizləndi.

Azərbaycan Böyük Qələbənin ilk addım səslərini noyabrın 8-də Qarabağın ürəyi sayılan, incisi hesab olunan Şuşa şəhərinin işğaldan azad edildiyi ilk saatlarda eşitdi. Bəli, bu qədim yurd yerimizin xilası ilə tam qələbəmizə yol açıldı. Düşmənin ağ bayraq qaldırmaq və kapitulyasiya etməkdən başqa yolu qalmadı. Döyüşlərdə bütün dünya Azərbaycan xalqının əzmini, Azərbaycan Ordusunun döyüş qabiliyyətini aydın gördü. Vətənpərvər xalqımızın öz Prezidentini necə dəstəklədiyi, onun ətrafında sıx birləşdiyi bir daha təsdiqləndi. "Ali Baş Komandanın bircə əmrinə müntəzirik"– deyən Azərbaycan əsgər və zabitləri öz sözlərinin sahibi olduqlarını döyüşdə sübuta yetirdilər.

Prezident İlham Əliyev xalqa müraciətlərinin birində demişdir: "Düşmənin əlində Azərbaycan Silahlı Qüvvələrinə məxsus olan bir dənə də hərbi texnika yoxdur... Döyüşlərin obyektiv müşahidə mənzərəsi var və istənilən hərbi mütəxəssis görə bilər ki, bu gün Azərbaycan Ordusu döyüş meydanında qələbə əldə edibdir. Azərbaycan Ordusu öz üstünlüyünü göstərir, Azərbaycan əsgəri və zabiti yüksək mənəvi-psixoloji keyfiyyətlər göstərir, mənəvi ruh göstərir. Çünki biz öz torpağımızda vuruşuruq, öz torpaqlarımızı azad edirik. Ermənistanın əsgərləri işğalçılardır. Döyüş gedən torpaq onların torpağı deyil".

Ona görə də döyüş əməliyyatlarında erməni əsgəri mövqelərini qoyub qaçır, Azərbaycan əsgəri isə öz torpağı uğrun-

da baş qoyur, canından keçirdi.

Qazanılan qələbələrdə qardaş Türkiyənin ölkəmizə hərtərəfli dəstəyi böyük rol oynadı. Türkiyənin dronları, PUA-ları düşmənə ağır zərbələr vuraraq onları qaçmağa məcbur etdi. Biz bu qələbəmizdə payı olan Türkiyə dövlətinə, Prezident Rəcəb Tayyib Ərdoğana təşəkkür edirik. Bir millət iki dövlət olan Azərbaycan-Türkiyə dostluğu sarsılmazdır və heç vaxt da sarsılmayacaq.

Müharibədə qazanılan qələbələrdə şübhəsiz ki, Göynük mahalımızdan olan igidlərimizin də əməyi böyük olmuşdur. Müharibənin başladığı ilk günlərdən könüllü şəkildə cəbhəyə gedən gənclərimizin döyüşlərdə göstərdiyi qəhrəmanlıqlar dillərdə dastandır. Bu döyüşlərdə iştirak edərək qəhrəmalıqlar göstərən Göynük mahalının qartallarının şücaətləri Ali Baş Komandan İlham Əliyev tərəfindən yüksək qiymətləndirilmişdir. Onlar düşmən üzərində qələbədə göstərdikləri qəhrəmanlıqlara görə orden və medallarla təltif edilmişlər. Düşmənlə döyüşlərdə üç nəfər Baş Göynüklü, iki nəfər Aşağı Göynüklü şəhid olmuşdur. Onların əziz ruhları qarşısında baş əyirik. Amma bizi qarşıda hələ daha böyük zəfərlər gözləyir. Bu dəfə zəfər, qələbə sorağımız hələ də işğal atında olan Zəngəzurdan, Göyçədən, İrəvandan gələcək. İrəvanı azad edəcək gələcək nəsillər qarşısında isə indidən baş əyirəm.

“ Göynük Qartalları İkinci Qarabağ müharibəsində” kitabı üçün yazdığım ön sözü qısa zamanda ərsəyə gətirdim. Sanki içim dolu imiş, necə başlayıb, necə tamamladım bilmədim. Bu mənim göynüklü igidlərimizin qəhrəmanlıqları qarşısında olan borcumun cüzi bir hissəsi idi ki, onu ödəməyə çalışdım. Amma hesab edirəm, mənim bu məqaləni yazmaqla gördü-

yüm iş, bu kitabı hazırlayan Şahin Aydəmirin, Osman Məmmədovun və gənc yazar İlkin İbrahimxəlilovun gördüyü işlə müqayisə olunmayacaq qədər cüzidir. Gələcək nəsillərin vətənpərvərlik duyğularının həmişə yüksək olmasında bu kitabın və ümumiyyətlə bu qəbildən olan kitabların rolu böyük olacaqdır. Bugünki tariximizin yazılaraq gələcəyə çatdırılmasında göstərdikləri operativliyə, dəyanətə və şücaətə görə müəlliflərə təşəkkür edirəm. Güman edirəm ki, bu kitab hər bir göynüklünün stolüstü vəsaitinə çevriləcəkdir.

**Əziz Mustafa,**
*Azərbaycan Yazıçılar Birliyinin üzvü,*
*yazıçı-jurnalist*

## QARABAĞ BİZİMDİR, QARABAĞ AZƏRBAYCANDIR!!!

2020-ci ilin 27 sentyabrını xalqımız adi günlərdən biri kimi qarşıladı. Havadan barıt qoxusunun iyisi duyulmağa başlamışdı. Bunu övlad yolu gözləyən minlərlə narahat ana ürəyi hiss etməyə bilməzdi. Amma ilkin olaraq heç kim heç nədən xəbərdar deyildi (cəbhə bölgəsində yaşayanlar xaric-müəl.). Səhər yeməyini yeyər-yeməz televiziya ekranından səslənən Azərbaycan Müdafiə Nazirliyinin bəyanatı əhvalımızı təlx etdi: “ Cəbhədə Ermənistan tərəfindən təxribat törədilməsi nəticəsində ölən və yaralananlar var”.

Hər gün buna bənzər bəyanatlar eşidirdik, amma 12 iyul Tovuz hadisələrindən sonra, ələlxüsus da general Polad Həşimovun şəhid olmasından sonra tikan üstündə oturmuşduq sanki. Qulağımızın biri daim xəbər gözləyirdi. Ali Baş Komandanın irəli əmrindən ötrü alışıb-yanırdıq. Gedən proseslərdən çıxan nəticə isə bu idi ki, Ali Baş Komandan hazırlıqlarını görən kimidir. Nəhayət 27 sentyabrda həsrətində olduğumuz an gəlib çatdı.

Müdafiə Nazirliyinin məlum bəyanatından sonra Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan cənab İlham Əliyev televiziya vasitəsilə xalqa müraciət etdi:

> **-Bu gün səhər Ermənistan silahlı qüvvələri bir neçə istiqamətdən müxtəlif növ silahlardan, o cümlədən ağır artilleriyadan istifadə edərək bizim yaşayış məntəqələrimizi, eyni zamanda, hərbi mövqelərimizi atəşə tutmuşdur.**
>
> **Düşmən atəşi nəticəsində mülki əhali və**

hərbçilərimiz arasında itkilər, yaralananlar var. Allah şəhidlərimizə rəhmət eləsin! Onların qanı yerdə qalmayacaqdır. Azərbaycan Ordusu hazırda düşmənin hərbi mövqelərinə atəşlər, zərbələr endirir və bu zərbələr nəticəsində düşmənin bir çox hərbi texnikaları sıradan çıxıb. Bu, erməni faşizminin növbəti təzahürüdür.

Son vaxtlar Ermənistanın Azərbaycana qarşı hərbi təxribatları müntəzəm xarakter almışdır. İyul ayında Ermənistan-Azərbaycan dövlət sərhədinin Tovuz istiqamətində yenə də artilleriya atəşi nəticəsində hərbçilərimiz və mülki şəxs həlak olmuşdur. Heç kəsə sirr deyil ki, ilk atəşi, o cümlədən artilleriya atəşini Ermənistan açıbdır və ilk həlak olanlar da məhz Azərbaycan hərbçiləri olmuşdur. Azərbaycan düşmənə layiqli cavabını verdi və düşmən bir santimetr irəliyə gedə bilmədi. Düşmən dayandırıldı, ölkəmizin ərazi bütövlüyü qorundu. Sarsıdıcı zərbələr nəticəsində Ermənistan tərəfi məcbur olub acı məğlubiyyətlə razılaşdı. Mən bu barədə demişəm, bir daha demək istəyirəm, əgər bizim istəyimiz olsaydı hərbi döyüşləri Ermənistan ərazisinə keçirə bilərdik. Ancaq bizim Ermənistan ərazisində hərbi hədəflərimiz yoxdur və belə olan halda bir neçə gündən sonra atəş dayandırılmışdır.

Ermənistan bu təxribatı törətməklə

**hansı məqsədi güdürdü? İlk növbədə Azərbaycan torpaqlarının işğalı onların planındadır və onlar bunu gizlətmirlər. Onların hərbi-siyasi rəhbərliyi Azərbaycanı yeni işğalla hədələməyə çalışırdı, yeni ərazilər uğrunda yeni işğal siyasəti. Budur, bu gün Ermənistan hərbi-siyasi rəhbərliyinin siyasəti. Digər səbəb Ermənistanda mövcud olan çox ciddi sosial, iqtisadi və siyasi məsələlərdən ölkə əhalisinin fikrini yayındırmaq və Azərbaycandan düşmən obrazı yaratmaqdır. Daha bir səbəb isə ondan ibarətdir ki, Ermənistan hər vəchlə çalışır ki, danışıqlar prosesi pozulsun və deyə bilərəm ki, buna nail olub. Məhz Ermənistanın riyakar, qeyri-konstruktiv və yalançı siyasəti nəticəsində hazırda danışıqlar faktiki olaraq dayanıbdır. Növbəti təxribatın törədilməsi məhz bu məqsədləri güdür və bu məqsədlər onlar üçün əsas məqsədlərdir.**

**İyul ayında Azərbaycan düşmənə layiqli cavabını verdi, öz ərazi bütövlüyünü qorudu və bir daha göstərdi ki, Azərbaycanla hədə-qorxu dili ilə danışan bundan peşman olacaqdır. Əfsuslar ki, bu, onlar üçün dərs olmadı. Halbuki mən iyul təxribatından sonra demişdim ki, Ermənistanın bu acı məğlubiyyəti onlar üçün dərs olmalıdır.**

**Avqust ayında Ermənistan növbəti hərbi təxribata əl atdı. Bu dəfə Azərbaycana di-**

versiya qrupu göndərilmişdir. Diversiya qrupunun başçısı Azərbaycan hərbçiləri tərəfindən saxlanılmışdır və hazırda ifadələr verir. Bu ifadələrdə açıq-aydın göstərilir ki, planlaşdırılmış təxribatçı diversiya qrupu Azərbaycana terror aktları törətmək üçün gəlmişdir. Mülki əhaliyə və hərbçilərimizə qarşı növbəti hərbi təxribat bu gün Ermənistan tərəfindən törədildi və qeyd etdiyim kimi, bu dəfə də onlar öz cəzasını alıblar və alacaqlar.

Ermənistanın təxibatları, eyni zamanda, Ermənistan rəhbərliyi tərəfindən verilən bəyanatlarda da öz əksini tapır. Ermənistanın baş naziri bir il bundan əvvəl işğal edilmiş torpaqlarda-Xankəndidə demişdir ki, "Qarabağ Ermənisatndır və nöqtə". Birincisi bu, yalandır, Qarabağ Azərbaycandır və mən bu məsələ ilə bağlı öz fikirlərimi dəfələrlə bildirmişəm. Qarabağ Azərbaycandır və nida işarəsi. İkincisi, bu təxribat xarakterli bəyanat faktiki olaraq danışıqlar prosesinə vurulan böyük zərbə idi. Əgər Ermənistanın Baş naziri deyirsə ki, "Qarabağ Ermənistandır", onda hansı danışıqlardan söhbət gedə bilər?! Bununla paralel olaraq, Ermənistanın rəhbərliyi artıq iki il ərzində dəfələrlə bəyan edir ki, Azərbaycan Ermənistanla yox, qondarma "Dağlıq Qarabağ respublikası" ilə danışıqlar aparmalıdır.

**Bu da danışıqlar prosesinə vurulan böyük zərbədir. İlk növbədə, Azərbaycan heç vaxt oyuncaq xunta rejimi ilə hər hansı bir danışıqlar aparmayacaq. İkincisi, danışıqlar formatını dəyişdirmək cəhdləri bir daha onu göstərir ki, Ermənistanın əsas məqsədi danışıqları pozmaq və status-kvonu saxlamaqdır. Halbuki ATƏT-in Minsk qrupunun həmsədr ölkələrinin dövlət başçıları dəfələrlə bəyan etmişlər ki, status-kvo qəbul edilməzdir və bu, o deməkdir ki, işğala son qoyulmalıdır.**

**Ermənistanın bizə qarşı təxribatları bu faktlarla bitmir. Bu yaxınlarda bizim qədim Azərbaycanın qədim şəhəri olan Şuşada qondarma kriminal xunta rejiminin başçısının "andiçmə" mərasimi keçirilmişdir. Bu, təxribat deyilmi? Bu, bizə qarşı təhqirdir. Onlar hesab edirdilər ki, biz bu təhqirlə barışacağıq, razılaşacağıq. Onlar bizi şüurlu şəkildə təxribatlara çəkirlər və bunun acı nəticələrini görəcəklər.**

**Bu yaxınlarda qondarma "Dağlıq Qarabağ respublikası" parlamentinin qədim Azərbaycan şəhəri-Şuşaya köçürülməsi haqqında qərar qəbul etdi. Bu, növbəti təxribatdır. Bu yaxınlarda Ermənistanın baş naziri bəyan etmişdir ki, on minlərlə insanı birləşdirən "könüllü" hərbi birləşmələr yaradılacaqdır. Bu, nə üçün lazımdır? Bunlar**

**kimə qarşı vuruşacaqlar? Bu, Azərbaycana qarşı bu gün törədilən təxribatın hazırlıq mərhələsi idi. Mən artıq bir neçə dəfə demişdim, o cümlədən bu yaxınlarda BMT kürsüsündən demişdim ki, Ermənistan yeni müharibəyə hazırlaşır, Ermənistan dayandırılmalıdır və dayandırılacaqdır.**

**Ermənistan işğal edilmiş torpaqlarda qanunsuz məskunlaşma siyasəti aparır. Bu yaxınlarda Livan ermənilərindən ibarət bir neçə ailə Dağlıq Qarabağa, o cümlədən Azərbaycanın qədim şəhəri olan Şuşaya yerləşdirildi. Bu, hərbi cinayətdir. Bu, Cenevrə Konvensiyasına tamamilə ziddir. Bu cinayətə görə Ermənistan cavab verəcəkdir. Bu, bizə qarşı növbəti təxribatdır. İşğal edilmiş torpaqlarda məskunlaşma aparmaq cinayət hesab olunur və bu siyasət Ermənistan tərəfindən uzun illər aparılır. İş burasındadır ki, Ermənistanda mövcud olan ağır iqtisadi, siyasi və sosial vəziyyətə görə ölkə əhalisi azalır. Ermənistanda demoqrafik böhran yaşanır və onlarda insan resursları yoxdur ki, işğal edilmiş torpaqlarda öz adamlarını yerləşdirsinlər. Ona görə xaricdə yaşayan ermənilərə ümid edirlər. Hazırda bu siyasət davam etdirilir. Bununla paralel olaraq, bizdə olan dəqiq məlumata görə, bizim işğal edilmiş bəzi ərazilərimizdə Ermənistan qanunsuz məskunlaşma aparıb-**

**dır. Bizim rayonlarımızın, kəndlərimizin adları dəyişdirilir. Azərbaycanlıların tarixi irsi silinir. Bizim tarixi abidələrimiz dağıdılır. Azərbaycan məscidləri dağıdılır, təhqir edilir. Bizim məscidlərimizdə Ermənistan inək, donuz saxlayır. Bu, bütün müsəlman aləminə ən böyük təhqirdir. Bizim əcdadlarımızın qəbirləri traktorla dağıdılır. Bunu edən faşistlərdir, vandallardır, vəhşilərdir.**

**Eyni zamanda, işğal edilmiş torpaqlarda bu yaxınlarda keçirilmiş hərbi təlimlər bizim üçün Ermənistanın növbəti təxribatı sayılmalıdır. Çünki bu təlimlərin bir məqsədi var: Azərbaycana hücum etmək, mülki əhalini atəşə tutmaq və yeni torpaqlar işğal etmək! Sadaladığım bütün faktlar bir daha onu göstərir ki, bu gün regionda təhlükə mənbəyi Ermənistandır və onun çirkin siyasətidir.**

**Azərbaycan heç bir təxribata əl atmamışdır. Azərbaycan sadəcə olaraq öz maraqlarını müdafiə edir, öz mövqeyini dəstəkləyir və öz siyasətini alnıaçıq aparır. Biz dəfələrlə bəyan etmişik ki, Dağlıq Qarabağ əzəli Azərbaycan torpağıdır və bu, həqiqətdir. Ermənistanın baş naziri deyəndə "Qarabağ Ermənistandır", bu yalandır. Mən deyəndə ki, "Qarabağ Azərbaycandır", bu, həqiqətdir. Bütün dünya Dağlıq Qarabağı Azərbaycanın ayrılmaz hissəsi kimi tanıyır.**

Tarixi ədalət bizim tərəfimizdədir. Çünki bu, bizim doğma, dədə-baba torpağımızdır. Beynəlxalq hüquq bizim tərəfimizdədir. Bütün beynəlxalq təşkilatlar Azərbaycanın ərazi bütövlüyünü tanıyır. Bütün ölkələr Azərbaycanın ərazi bütövlüyünü tanıyır. Beynəlxalq təşkilatlar çərçivəsində qəbul edilmiş qərar və qətnamələr Dağlıq Qarabağın Azərbaycana məxsus olduğunu açıq-aydın təsbit edir. BMT təhlükəsizlik Şurasının dörd qətnaməsində deyilir ki, erməni silahlı qüvvələri dərhal, tam və qeyd-şərtsiz işğal edilmiş torpaqlardan çıxarılmalıdır. Otuz ilə yaxındır ki, bu qətnamələr kağız üzərində qalır. Otuz ilə yaxındır ki, Minsk qrupu çərçivəsində danışıqlar aparılır və bunun sonunda Ermənistan müntəzəm olaraq hərbi təxribatlar törətməklə danışıqlar prosesini iflic vəziyyətə salıbdır. BMT-dən başqa bütün digər aparıcı beynəlxalq təşkilatlar bizim haqlı mövqeyimizi müdafiə edir. Qoşulmama Hərəkatı BMT-dən sonra ikinci ən böyük beynəlxalq təsisatdır ki, bu gün Azərbaycan bu təsisata sədrlik edir. Onlar münaqişə ilə bağlı ədalətli qətnamə qəbul etmişlər. İslam Əməkdaşlıq Təşkilatı ədalətli qətnamələr qəbul etmişdir. ATƏT-in qərarları, Avropa Parlamentinin qətnamələri bizim mövqeyimizi dəstəkləyir. Bizim mövqeyimiz beynəlxalq hüquqa və ədalətə əsasla-

**nır. Biz öz torpağımızda vuruşuruq. Bu gün Azərbaycan Ordusu Azərbaycan torpaqlarında düşmənə sarsıdıcı zərbələr endirir. Bu gün Azərbaycan Ordusu öz torpağında Azərbaycanın ərazi bütövlüyünü qoruyur, müdafiə edir. Erməni əsgərinin bizim torpağımızda nə işi var? Heç kəs üçün sirr deyil ki, "Dağlıq Qarabağ ordusu"nun tərkibində olan şəxsi heyətin 90 faizi Ermənistan vətəndaşlarından ibarətdir. Ermənistan işğalçı dövlətdir, bu işğala son qoyulmalıdır və qoyulacaqdır.**

**Biz haqq yolundayıq. Bizim işimiz haqq işidir. Biz zəfər çalacağıq!**

**Qarabağ bizimdir, Qarabağ Azərbaycandır!..**

Ermənistan silahlı qüvvələri tərəfindən Tərtər rayonunun Qapanlı, Ağdam rayonunun Çıraqlı və Orta Qərvənd, Füzuli rayonunun Mirzənağılı, Qazaxlar, Əhmədalılar, Alxanlı, Şükürbəyli kəndləri və Horadiz şəhəri, Cəbrayıl rayonunun Cocuq Mərcanlı kəndi 27 sentyabr 2020-ci il saat 06:00 radələrində iriçaplı silahlar, minaatanlar və müxtəlif çaplı artilleriya qurğuları vasitəsilə intensiv atəşə tutulmuşdur. Bunun nəticəsində Azərbaycanın mülki əhalisi arasında həlak olan və yaralananlar olmuş, mülki infrastruktur obyektlərinə ciddi ziyan dəymişdir.

Eyni gündə Azərbaycan Silahlı Qüvvələrinə aid şəxsi heyət və tank bölmələrinin raket-artilleriya qoşunlarının bölmələri, cəbhə aviasiya və pilotsuz uçuş aparatlarının dəstəyi ilə

Ermənistan silahlı qüvvələrinin ön xətdə müdafiənin dərinliyində yerləşən xeyli sayda canlı qüvvəsi, hərbi obyektləri və döyüş texnikası, o cümlədən 12 ədəd "OSA" zenit raket kompleksi aşkar edilərək məhv edilmişdir. Bundan əlavə Azərbaycan Hərbi Hava Qüvvələri cəbhənin Tərtər istiqamətində bir döyüş helikopteri vurmuş, ekipaj üzvləri isə sağ qalmışdır...

# “GÖYNÜK QARTALLARI”
# İKİNCİ QARABAĞ MÜHARİBƏSİNDƏ

“Göynük Qartalları ”nın ikinci Qarabağ müharibəsindəki qəhrəmanlıqlarından bəhs edən kitablar gələcəkdə çox yazılacaqdır. Bizlər isə İkinci Qarabağ müharibəsinin birinci ildönümü ərəfəsində Şəki rayonunun Göynük bölgəsində dünyaya gəlmiş, böyümüş, püxtələşmiş və Azərbaycanımızın ayrı-ayrı guşələrində yaşamağa başlamış övladlarımızı -İkinci Qarabağ müharibəsinin iştirakçılarını bir daha xatırlamaq, gələcək nəsillərə tanıtmaq məqsədilə bu kitabı çapa hazırlamağı məqsədə uyğun hesab etdik.

Mövzuya keçməzdən əvvəl Göynük mahalının və göynüklülərin qəhrəman keçmişinə bir nəzər salıb, heç nəyin təsadüfdən yaranmadığına diqqətinizi cəlb etmək istərdik.

Bir şeyi unutmayaq ki, “ot kökü üstə bitir”. Göynük mahalının qəhrəmanlıqlarla dolu tarixi az qala bütün dünyaya bəllidir. Bunu göynüklü olduğumuz üçün demirik: tarixi faktlar, cərəyan etmiş hadisələr bizə imkan verir ki, dogma göynüyümüzlə qürur duyaq və onun barəsində bütün cahana car çəkək.

Göynük mahalının qədim tarixinə əlimiz çatmasa da, orta əsrlər dövrünə aid əlimizdə samballı monoqrafiya vardır. Azərbaycan Milli Elmlər Akademiyası, A.A.Bakıxanov adına Tarix İnstitutunun əməkdaşı Ənvər Məmmədovun yazıb çapa təqdim etdiyi və 2016-cı ildə işıq üzü görmüş “ Göynük Hərəkatı (1805-1930-cu illər)” monoqrafiyası Göynüyün qəhrəman keçmişi barədə bizlərə kifayət qədər məlumatlar verir.

Monoqrafiyada yazılanlardan oxuyuruq ki, Şəki xanlığının ən böyük mahallarından olan Göynük bölgənin ən döyüşkən, mübariz insanlarının yaşadığı məntəqə idi.

1805-ci ildə Qarabağlı İbrahimxəlil xandan sonra Şəki xanı Səlim xan da Kürəkçay müqaviləsinə əsasən Çar Rusiyasının vassallığını qəbul etdi. Xanlardan fərqli olaraq xalq bu qərarı qəbul etmək fikrində deyildi. Sonrakı hadisələr bizim fikrimizi tam mənasında təsdiq edir.

Qarabağ xanı İbrahimxəlil xanın könüllü olaraq Rusiyanın vassallığını qəbul etməsinə baxmayaraq 1806-cı ildə onu ailəsi ilə birlikdə qətlə yetirdilər. Fitvanı verən ermənilər, icra edənlər isə rus hərbçiləri idi.

İbrahimxəlil xan Səlim xanın bacısının həyat yoldaşı olduğu üçün bu hadisə ikinci xana pis təsir etdi. Bu olaydan sonra Səlim xan ruslardan qisas almaq məqsədilə Şəkidə yerləşən, ruslardan ibarət qarnizonu məhv edərək sonu bəlli olmayan böyük bir mübarizəyə qalxdı.

Səlim xanın bu addımı Şəkini nəinki Azərbaycanın, ümumilikdə Cənubi Qafqazın rus istilasına qarşı strateji müqavimət mərkəzlərindən birinə çevirdi. Hərəkatın önündə isə göynüklülər dururdu.

**"Göynük Hərəkatı (1805-1930-cu illər)" kitabından:**

-… general-leytenant baron İ.K.Rozenə yazdığı 28 oktyabr 1806-cı il tarixli təliqədə o, Səlim xanın Göynükdə yerləşdiyini, bütün vasitələrdən istifadə edərək onu ailəsi ilə birlikdə tutmağa çalışdığını bildirir… Şəki xanını cəzalandırmaq üçün göndərilən general-mayor P.F.Nebolsinin başçılığı altında olan qoşunla vuruşmada Səlim xan məğlub edildi. Məğlub edilən Səlim xan Abbas Mirzənin düşərgəsinə pənah apardı və ömrünün sonuna kimi rus işğalçılarına qarşı mübarizə apardı".

Səlim xanın hakimiyyətindən sonra Çar Rusiyası Şəkiyə heç bir aidiyyəti olmayan Cəfərqulu adlı birini xan təyin etdi.

Cənubi Azərbaycanın Xoy vilayətindən Şəkiyə köç etmiş yüzlərlə insandan biri olan Cəfərqulu xan hakimiyyətinin ilk günlərindən başlayaraq Çar Rusiyasının İranda yaşayan ermənilərin Şimali Azərbaycan ərazilərinə köçürülməsi kompaniyasında böyük canfəşanlıq göstərdi. Şəkinin ayrı-ayrı kəndlərində İrandan köçürülmüş erməniləri toplum halında yerləşdirdi. Bu isə qeyrətli, vətənpərvər şəkililərin, o cümlədən göynüklülərin narazılığına səbəb olmaya bilməzdi.

**“Göynük Hərəkatı (1805-1930-cu illər)” kitabından:**

-…görülən bütün tədbirlərə baxmayaraq əhali ermənilərin Nuxa qəzasına köçürülməsində bilavasitə iştirak etmiş Cəfərqulu xanı qəbul etmirdi. Öz hakimiyyətinin təhlükəsizliyinə əmin olmayan Cəfərqulu xan isə yanında daim öz yaxın adamlarından ibarət qoşun saxlayırdı. Tabe olmaq istəməyən əhali, ilk növbədə də göynüklülər 1807-ci il aprel ayının sonlarında bir daha üsyana qalxır. Üsyanın başında Göynük elinin igid oğlu Sultan Murad dururdu.

Bu barədə podpolkovnik Tixonovski qraf Qudoviçə yazdığı təliqədə o, Osmanlı paşası tərəfindən məktub alan carlıların və Şəki əyalətində, İnçə çayı ətrafında yaşayan Sultan Muradın Cəfərqulu xana qarşı üsyan qaldırmaq niyyətləri barədə məlumat verirdi. Onun sözlərinə görə hazırlanan üsyanın başında Sultan Murad durur. Nəticədə işğalçılara qarşı ayağa qalxan Baş və Aşağı Göynük kəndlərinin əhalisi Burcu kəndi yaxınlığında mövqe tutur. Bu barədə məlumat verən Kabardin muşketyor alayının komandiri mayor Qrekov qraf Qudoviçə göndərdiyi 1807-ci il 5 may tarixli təliqəsində bildirirdi: “Cəfərqulu xana tabe olmaq istəməyən bu iki kəndin əhalisi Sultan Murad yüzbaşının başçılığı altında öz məskənlərini tərk edərək,

Burcu kəndinin yaxınlığında möhkəmləniblər. Onlar tərəddüd içərisində olan qonşu əyalətlərin əhalisini də üsyana qaldırmaq niyyətindədirlər”.

Üsyançıların üzərinə getməkdən çəkinən Cəfərqulu xan təkidlə rus komandanlığından yardım tələb edir. Nəticədə Qrekovun başçılığı altında toplarla silahlanmış 100 nəfərlik əsgəri hissə və İlisu sultanının 1000 nəfərlik dəstəsindən ibarət böyük bir qüvvənin Cəfərqulu xanın köməyinə gəlməsindən sonra onlar üsyançıların mövqe tutduqları Burcu kəndinə yaxınlaşa bilirlər. Rus komandanlığının təslim olmaq tələbinə rədd cavabı verən göynüklülər onlarla hər hansı danışıqlara getməkdən imtina edirlər. Həyəcanları yalnız aprelin 28-də yatırmaq mümkün olur. Ailəsi ilə birlikdə dağlara çəkilən Sultan Muradı yalnız üç günlük gərgin axtarışlardan sonra tutmaq mümkün olur. Onun üzərindən tapılmış məktublardan bəlli olur ki, Göynük üsyançılarının şirvanlı Mustafa xanla sıx əlaqələri olmuşdur.

Üsyanın yatırılmasından sonra mayor Qrekov və Cəfərqulu xan sərəncamlarındakı qüvvələrlə üsyanın nəticələrinin aradan qaldırılması, əhalinin itaətə gətirilməsi və onların yaşayış yerlərinə qaytarılması məqsədilə tədbirlər gördükdən sonra mayın 2-də qalaya qayıdırlar. Onlarla birlikdə Şəkiyə gətirilən Sultan Murad burada qalaya salınır…

Göynük mahalında növbəti həyəcan 1808-ci ildə baş verir. Həmin vaxt çoxsaylı dağlı dəstəsinin başında Cara gələn qazıqumuxlu Surxay xan buradan Cəfərqulu xana qarşı çıxış etmək üçün Cəlayır kəndinə gedir. Onun carlılarla birləşdikdən sonra daha da böyümüş dəstəsində keçmiş Şəki xanı Məhəmmədhəsən xan və Şirvanlı Qasım xan da var idi. Tərəflər arasında Göynük yaxınlığında meşədə iki saat davam etmiş qanlı döyüş baş verir. Artilleriya atəşləri qarşısında uzun müddət duruş gə-

tirə bilməyən birləşmiş üsyançı qüvvələr geri çəkilmək məcburiyyətində qalırlar. Üsyanda iştirak etmiş kəndliləri cəzalandırmaq üçün rus hərbi hissələrinin başında Əmbərçaya gələn Cəfərqulu xan, kəndlərdə cəza dəstələri yerləşdirir, həbslər aparır, əhalidən girovlar götürür, onların üzərinə cərimələr qoyur.

Bundan sonra 1807-ci il Göynük üsyanının başçısı, eləcə də 1808-ci il hadisələrində yaxından iştirak etmiş Sultan Murad bir neçə göynüklü silahdaşı ilə rus məhbəsindən Car-Balakənə qaçmağa müvəffəq olur. İgid göynüklü regionun rus istilasına qarşı mübarizəsini bundan sonra Car-Balakəndə davam etdirir.

Beləliklə, tam əminliklə söyləyə bilərik ki, birinci rus-qacar savaşı gedişində Azərbaycanda istilaçılara qarşı müqavimətin əsas mərkəzlərindən biri vətənimizin Şimal-Qərb bölgəsi olmuşdur. Mübarizənin ön cərgələrində də heç şübhəsiz Baş göynüklülər dururdu.

İkinci rus-qacar müharibəsi öncəsi Şimal-Qərbi Azərbaycanda həyəcanlı anlar yaşanmaqda davam edirdi. 1813-cü il "Gülüstan" "sülh" müqaviləsindən sonra Cənubi Qafqaza tam hakim olan Çar Rusiyası sabitliyi heç cür təmin edə bilmirdi. Bir milləti iki hissəyə bölən Rusiya imperiyası güman edirdi ki, savadsız kütlənin üstünlük təşkil etdiyi Şimali Azərbaycanın əhalisini asanlıqla ram edəcək. Ancaq baş verən hadisələr rusların düşündüklərinin əksini ortaya qoymuşdu.

Təkcə Nuxa qəzasında cərəyan edən hadisələr "Gülüstan" "sülh" müqaviləsinin fiaskoya uğramasına səbəb ola bilərdi.

**"Göynük Hərəkatı (1805-1930-cu illər)" kitabından:**

-1826-cı ilin yayına doğru ikinci rus-qacar müharibəsinin təsiri ilə Şimal-Qərbi Azərbaycanda yenidən həyəcanlı vəziyyət yaranır. Həmin vaxtı Osmanlı dövlətində vəfat etmiş keç-

miş Şəki xanı Səlim xanın Qacarlar İranında olan oğlu Hüseyin xanın Şəki əyalətinə gəlişi ilə əhalinin böyük əksəriyyəti ona qoşulur. Nuxada həyəcanlı vəziyyətin yaranması Qafqazdakı rus ordularının baş komandanı, general A.P.Yermolovu rusların Nuxadakı iki rotasını əyalətdən çıxarmağa məcbur edir. Özünü Şəki xanı elan edən Hüseyin xan ümumi üsyan planına əsasən Şəki əyalətindən bacardıqca çox silahlı qüvvə toplayaraq car-balakənlilərlə Kaxetiyaya hücum etməli idi.

Həmin vaxtı Car-Balakəndə də üsyana ciddi hazırlıq gedirdi. Danaçı kəndində keçirilən yığıncaqda başlanmış müharibə ilə əlaqədar ümumi üsyana hazırlıq işi müzakirə edilir. Bu yığıncağın qərarı ilə Kuklun Şaban Qacar şahzadəsi Abbas Mirzənin yanına göndərilir. Lakin hazırlanan ümumi üsyanın rəhbərlərindən olan qazıqumuxlu Surxay xanın qəfil ölümü çıxışın təxirə salınmasına səbəb olur.

Sentyabrın əvvəllərinə doğru Şimal-Qərbi Azərbaycanda üsyana hazırlıqlar yenidən başlayır. Artıq sentyabrın sonunda Beybulatın başçılığı ilə çeçenlərin iki minlik dəstəsi Danaçı kəndinə, Əlisgəndər bəyin iki oğlu (onlardan biri sonralar Dağıstan və Çeçenistanın ikinci imamı olmuş Həmzət bəy idi-Ə.M.) və Surxay xanın nəvəsi Mahmat xanın başçılıq etdiyi beş min nəfərlik qüvvə isə Carda yerləşmişdi. Lakin Qacar ordularının Şəmkir yaxınlığındakı məğlubiyyəti və ardınca knyaz Eristovun başçılığı ilə səkkiz minlik rus qoşununun Cara yürüşü onları qəti hərəkət etməkdən çəkindirir. Qafqazdkı rus ordularının baş komandanı, general A.P.Yermolovun böyük qüvvənin başında sentyabrın 19-da Nuxaya daxil olmasından sonra Hüseyin xan əyalətin ərazisini tərk edir…

1838-ci ilin avqustunda Nuxa qəzası növbəti dəfə rus istilasına qarşı üsyana qalxdı. Üsyançılar bir-neçə günlüyünə olsa

da qəzanın mərkəzini əllərində saxlaya bildilər. Bu üsyanda da göynüklülər öndə idilər…

1863-cü ildə Şimal-Qərbi Azərbaycanda yenidən həyəcanlı hadisələr cərəyan etməyə başladı.

**"Göynük Hərəkatı (1805-1930-cu illər)" kitabından:**

-Müridizmin bayrağı altında bütövlükdə Qafqazın müsəlman əhalisini "kafirlərə qarşı" cihada qaldırmaq məqsədilə hazırlanan Ümumqafqaz üsyanının əsas təşkilatçıları vaxtilə Qafqazdan Osmanlı dövlətinə mühacirət etmiş nüfuzlu din xadimləri idilər. Onlardan biri də Baş Göynükdən Osmanlı dövlətinə mühacirət etmiş, İstanbulda yaşayan Hacı Yusif Hacı Həsən oğlu idi. İmperatorluğun rəsmi xəfiyyə idarəsinin verdiyi məlumata görə Hacı Yusif Hacı Həsən oğlu Osmanlı sarayının etibarlı adamlarından olmaqla yanaşı, həm də türk ruhaniləri arasında böyük nüfuza malik idi.

XIX əsrin 60-cı illərinin əvvəllərində qafqazda gizli şəkildə hazırlanan Ümummüsəlman üsyanının fəal təşkilatçılarından olan Hacı Yusif Hacı Həsən oğlu doğma kəndi vasitəsilə Azərbaycandakı müridizm şeyxləri ilə çox sıx əlaqə saxlayırdı. Onun həmçinin Nuxa-Zaqatala bölgəsində də böyük nüfuzu vardı. Bunun nəticəsidir ki, onun bilavasitə iştirakı ilə Baş Göynükdə yaşayan qardaşları Hacı İdris Hacı Həsən oğlu və Hacı Həmid, eləcə də Baş Şabalıd kənd sakini Sofi Ağa Muğlan və digər müridizm şeyxləri ilə üsyan planı hazırlanmışdı.

Hazırlanan üsyanın ideoloji əsasını isə bəhs olunan dövrdə Qafqazda geniş yayılmış, müsəlmanları "kafirlərə qarşı" mübarizəyə çağıran "Zikr" təlimi təşkil edirdi.

Qafqaz müharibələrinin tədqiqatçısı, hərb tarixçisi R.A.Fadeyevin yazdığına görə, Cənubi Qafqazda zikr təliminin mər-

kəzi Nuxa qəzası idi. Bu təlimin bölgədə ən nüfuzlu nümayəndələri Nuxa şəhəri üzrə Ağa Əbdülkərim Məmmədəmin oğlu (sənədlərdə onun 400 müridinin olduğu göstərilməklə ən yaxın köməkçilərinin sırasında Hacı Qafur Əfəndi, Hacı Mahmud və Əli Rəbiə oğlunun adları çəkilir). Baş Göynük kəndində Hacı İdris Hacı Həsən oğlu (sənədlərdə üsyan zamanı onun başçılığı altında Baş Göynükdə 2000 nəfərə çatan dəstənin toplandığı qeyd olunur), onun qardaşı Hacı Həmid Hacı Həsən oğlu (Göynük kəndinin imamı-Ə.M.), Əhməd Əfəndi, Baş Şabalıdda Sofi Ağa Muğlan, Qışlaq kəndində Hacı Rəhim, 1863-cü il Zaqatala üsyanının rəhbərlərindən olmuş carlılar, Burca Əli, Zəngi Əfəndi, eləcə də hümbetli Tintin Mahama da bölgədə tanınmış zikr təlimi ustadları idilər…

… Baş Göynük yenə də hazırlanan Ümumqafqaz üsyanının Cənubi Qafqazdakı mərkəzinə çevrilmişdi. Bu nəhəng, Ümumqafqaz üsyanı ərəfəsində Baş Göynükdə Hacı İdris Hacı Həsən oğlu və qardaşı Hacı Həmidin başçılığı altında hər an çıxışa hazır 2000 nəfərlik süvari dəstə toplanmışdı.

Təsadüfi deyildi ki, Zaqatala üsyanı ərəfəsində Hacı Murtuz və Zəngi Əfəndinin qonşu bölgələrin əhalisini üsyana çağıran 50-ə yaxın məktubu Baş Göynüyə, bölgənin ən nüfuzlu adamlarından biri kimi Hacı İdris Hacı Həsən oğluna göndərilmişdi. Hacı İdris isə həmin məktubları Göynük mahalı, Samur dairəsi və digər bölgələrə yollamışdı. Zaqatala üsyançılarının başçısı Hacı Murtuzla Göynük şeyxləri Hacı İdris, Əhməd Əfəndi, eləcə də Baş Şabalıd sakini Sofi Ağa Muğlan və nuxalı Ağa Əbdülkərim arasında getmiş yazışmalar barədə sənədlərdə verilən məlumatlardan bəlli olur ki, bölgədə ümumi üsyana hazırlıq mərkəzi Baş Göynükdə yerləşirdi…

Ümumi plana görə üsyanın başlanması ilə talalı Hacı Əli-

nin dəstəsi Almalı körpüsünü ələ keçirib carlılarla birləşməli, ilisuluların bir hissəsi nuxalılarla Salavat aşırımını tutmalı, digər hissəsi Zaqatalaya hərəkət etməli idi. Göynüklü Hacı İdrisin başçılığı altındakı Baş Göynük, Aşağı Göynük, Biləcik, Baş Şabalıd və İnçə kənd sakinlərindən ibarət 2000 nəfərlik dəstə Nuxanı, Əbdülkərimin dəstəsi isə qəfil hücumla Nuxa qalasını ələ keçirməli idi. Dağlılarla aparılmış danışıqlara görə Hacı Murtuzun üsyana başlaması ilə Dağıstanın Ansux icmasının naibi Şaqo və digər dağlı dəstəsinin başçısı Xizri Gürcüstan tərəfdən gələ biləcək rus hissələrinin qarşısını almaq üçün öz dəstələri ilə Balakən və Laqodexi arasındaskı düzənliyə enməli idilər. Başqa bir dağlı dəstəsinin başçısı Bakrak isə birbaşa Hacı Murtuzun köməyinə gəlməli idi…

… Üsyançı qüvvələrin ümumi toplanış məntəqəsi kimi Qəbələdəki Qutqaşen kəndi müəyyən olunur. Qısa vaxtda bura bir-neçə minlik mürid dəstələri toplaşsa da, Qutqaşenin uzaqda yerləşməsi səbəbindən bura Şamaxı qəzasının bəzi müridizm şeyxləri gələ bilməmişdi. Buna görə də üsyan başçılarının növbəti toplanış yeri Bərgüşad məntəqəsinin İsmayıllı kəndi müəyyən olunur. İsmayıllı kəndinə toplaşan müridizm şeyxləri Zaqatala qalasına olacaq hücumun nəticəsini gözləyirdilər…

… Zaqatala üsyanının başçıları ilə müridizm şeyxləri arasında getmiş yazışmalardan, ilk növbədə Hacı Murtuzun şamaxılı Şeyx Hacı Abdi Əfəndiyə məktubundan bəlli olur ki, Azərbaycanın şimal qəzalarında hazırlanan ümumi üsyan planının gözlənilmədən açılması barədəki xəbər Hacı Murtuzu tələsik üsyanı başlamağa və Zaqatala qalasına hücuma keçməyə vadar edib. Balakən məntəqə rəisinin köməkçisi Georgi Qalacov tərəfindən Zaqatala qalasına olacaq hücumun dəqiq vaxtının Yuxarı Dağıstan vilayətinin rəisi knyaz Şalikov və Zaqatala dairəsi-

nin rəisi knyaz Tarxan Mouravova çatdırılması, qala komendantı Romanova qalanı üsyançıların hücumundan qorumaq üçün təcili tədbirlər görməyə imkan verir.

Nəticədə üsyan hazırlıqları tamamlanmadan edilən qəfil hücum sonda qala ətrafında üsyançıların məğlubiyyəti ilə nəticələnir. Və bu üsyanın Ümumqafqaz hərəkatına çevrilməsinə imkan vermir. Həmin vaxtı Bərgüşad məntəqəsinin İsmayıllı kəndinə toplaşmış Azərbaycanın şimal qəzalarının müridizm şeyxləri, eləcə də Dağıstanın cənub icmalarının üsyançı qüvvələri məhz Zaqatala üsyançılarının qala üzərinə olan hücumunun uğurlu nəticəsini gözləyirdilər. Zaqatala üsyançılarının ilk uğuru qalanın alınması ilə nəticələnməli idi ki, bu da Azərbaycanın şimal qəzalarında və Dağıstanda müridizmin bayrağı altında güclü üsyanın alovlanmasına səbəb olmalı idi.

Zaqatala qalasına olmuş uğursuz hücumdan sonra Hacı Murtuz iyunun 6-sı öz adamlarını dağlara və Baş Göynüyə göndərərək onları üsyanın gedişindən agah edir və təcili olaraq dağılışmağa, ümumi üsyan planını daha münasib vaxta kimi təxirə salmağa çağırır. Baş Göynükdən isə bu xəbər təcili olaraq bölgələrə çatdırılır. Nəticədə artıq iyunun 10-a kimi Bərgüşad məntəqəsinin İsmayıllı kəndinə toplaşmış üsyançı qüvvələr öz məntəqələrinə çəkilirlər.

Beləliklə, 1863-cü il Zaqatala üsyanı haqqında elmi dövriyyəyə ilk dəfə daxil edilmiş arxiv materialları Göynüyün XIX əsrdə Azərbaycanda müstəmləkə əleyhinə mübarizənin həm fiziki, həm də təşkilati mərkəzlərindən biri və hətta birincisi olması qənaətini təsdiqləyir. Göynüklülər nəinki fiziki və maddi cəhətdən üsyanlara qatılırdılar; Baş Göynük kəndi həmçinin müxtəlif üsyanların hazırlıq mərhələsində strateji qərargah rolunu oynayırdı…

Təqdim etdiyimiz faktlardan da göründüyü kimi göynüklülər həm maddi, fiziki cəhətdən üsyanlara qatılır, həm də hazırlanmış üsyanların strateji və taktiki tərəflərini işləyib hazırlayaraq rəhbərlik edirdilər. 1877-ci ildə baş vermis üsyanda da olaylar eyni sxem üzrə cərəyan etmişdir.

1877-ci il üsyanına keçmədən öncə Çar-Rusiyası ilə Osmanlı Türkiyəsi arasında baş vermis müharibəyə toxunmaq istərdik. Bildiyiniz kimi 24 aprel 1877-ci ildə Çar Rusiyası Qafqaz və Balkanlarda mövqelərini möhkəmlətmək məqsədilə Osmanlı ilə növbəti müharibəyə başladı. Bir il sürən müharibə Osmanlı dövlətinin məğlubiyyəti ilə nəticələndi. San-Stefano sülh müqaviləsinə (1878) əsasən, Rusiya Türkiyənin ermənilər yaşayan bir-neçə bölgəsini özünə birləşdirdi. Türkiyə həmin əraziləri (Qars, Ərdəhan və s.) yalnız 1918-ci ildə geri ala bildi…

Çar Rusiyası ilə Osmanlı Türkiyəsi arasında müharibə 1877-ci ilin 24 aprelində başladı. Şimal-Qərbi Azərbaycanda isə gərgin, səksəkəli və həyəcanlı anlara həmin ilin sentyabrında start verildi. Sizcə bu təsadüfi idimi? Aradan beş ay keçmiş, Rusiya-Osmanlı müharibəsi özünün alovlu çağını yaşayırdı. Belə bir məqamda Şimal-Qərbi Azərbaycan və dağlılar Osmanlı Türkiyəsinə kömək göstərməyib seyrçi qala bilməzdilər. Bundan əvvəlki üsyanlar göstərmişdi ki, 1806-cı ildən sonra Cənubi Qafqazda Azərbaycan türklərinin və dağlı xalqlarının Osmanlı sarayı ilə müttəfiqlik səviyyəsində anlaşmaları olmuşdur. Bütün addımlar planlı, məsləhətli şəkildə atılmışdır.

Cəbhədə döyüşən dövlətin içərisində üsyan çıxması həmin dövlətin qüvvələrinin parçalanmasına gətirib çıxara bilərdi. Bunu yaxşı bilən Şimal-Qərbi Azərbaycanın və dağlı xalqlarının liderləri Çar Rusiyasını içdən sarsıdaraq, Osmanlı dövlətinin

qələbəsinə çalışırdılar. Amma o dövrdə Avropa da Osmanlının mövcudluğuna son qoymaq istəyirdi. Buna görə Osmanlı meydanda tək qalmışdı.

**“Göynük Hərəkatı (1805-1930-cu illər)” kitabından:**

-… Sənədlərin verdiyi məlumatlardan aydın olur ki, müharibənin başlanması ilə Zaqatala dairəsi, Nuxa və Quba qəzalarında xırda silahlı dəstələr meydana gəlmişdi. Həmin vaxtı Qafqazda səyahətdə olmuş fransız səyyahı Karla Serena müharibənin təsiri ilə Şimal-Qərbi Azərbaycanda müşahidə olunan həyəcanlı vəziyyət barədə yazırdı: “Müharibə başlananda Qafqazın digər yerlərində olduğu kimi burada da türklərə kömək məqsədilə çoxlu xırda silahlı dəstələr yaradılmışdı. Mənim orada olduğum müddətdə zabit arvadları qaladan çıxmağa cürət etmədikləri halda, bu dəstələrin təhlükəli hücumları barəsində çox eşitsəm də, qaladan çıxıb gəzintiyə gedirdim. Çünki bilirdim ki, rus əsgərinin müşayiətilə çıxsam təhqirə məruz qala bilərəm”.

Karla Serena həyəcanların qarşısını almaq məqsədilə rus hakimiyyətinin gördüyü tədbirlər barədə də maraqlı məlumat verir: “Zaqatala qalasında yaşayanlar hər gün hücuma məruz qalacaqlarını gözləyirdilər. Qalanın komendantı da üsyanın baş verəcəyini bilirdi. Şübhəli şəxslər həbsə alınırdılar. Onların içərisində mollalar və qadınlar da vardı. Qoca, uzunsaqqal dindarların görkəmi məni daha çox həyəcanlandırırdı. Yəqin ki, onlar üçün ölüm ayağında zəngirlənmək dözülməz təhqir idi. Əyilmək onların təbiətinə yad bir xüsusiyyətdir. Həmin adamların gözlərindən barışmazlıq və kin duyulurdu…”

… Oktyabrın əvvəllərində dağlıların Nuxa qəzası və Zaqatala dairəsinə girmək niyyətində olmaları barədə xəbər alan

Yelizavetpol qubernatoru general-mayor, knyaz Çavçavadze Alazan vadisindəki hissələrin komandanı Andronikovdan xahiş edir ki, yerli batalyonu Nuxaya göndərsin. Lakin həmin vaxt Andronikovu əvəz etmiş general-mayor, knyaz Orbeliani Zaqatala dairəsindəki əhalinin üsyankar əhval-ruhiyyəsini və Kaxetiyadakı həyəcanlı vəziyyəti nəzərə alaraq Çavçavadzenin bu xahişini yerinə yetirə bilmir. Yalnız sərəncamındakı qüvvələri Yelizavetpol quberniyasının sərhədlərinə doğru çəkməklə kifayətlənir.

Artıq oktyabrın 15-də rusların alazan vadisindəki qüvvələri üsyançıların gözlənilən hücumunu dəf etmək məqsədilə aşağıdakı kimi düzülmüşdü: Qaxda Şirvan alayının 4-cü batalyonu, 4-cü Kuban atlı batareyasının bir bölüyü, Taman Kazak alayının 4-cü yüzlüyü, Qax piyada milisinin iki yüzlüyü, Zaqatala Çernomorsk alayının 4-cü, 5-ci, 8-ci və 12-ci xətti, 3-cü və 4-cü atıcı rotaları, Tiflis alayının 3-cü batalyonu, yerli Zaqatala batalyonu, 4-cü Kuban süvari batareyasının yarım batareyası, Qafqaz dağlı batareyasının yarım bölüyü, Taman kazak alayının 6-cı yüzlüyü, Sığnaq-Telav yüzlüyü və tuşin ovçular komandası; Laqodexidə Şirvan alayının 1-ci və 4-cü rotaları, Çernomorsk piyada alayının 6-cı və 7-ci rotaları, yerli komanda və 4-cü Kuban süvari batareyasının bir bölüyü; Mixaylovsk məntəqəsində Sığnaq drujinasının 2-ci yüzlüyü; Qaratubanda Sığnaq drujinasının 3-cü yüzlüyü və Pioner milisinin 2-ci piyada yüzlüyü; Çıaur körpüsündə Sığnaq drujinasının 1-ci yüzlüyü; Kvareli kəndində Sığnaq drujinasının 4-cü yüzlüyü; Şilda kəndində və Xando məntəqəsində 2-ci Telavi drujinasının 3-cü və 4-cü yüzlükləri; Sabui kəndində Telav və Sığnaq yerli komandasının yarım batalyonu, 2-ci Telav drujinasının 2-ci yüzlüyü və Tioneti milisinin 3-cü süvari yüzlüyü; Pankisi dərəsində

Tioneti milisinin 1-ci və 3-cü piyada yüzlükləri; kistinlərin yaşadığı ərazi ilə sərhəddə Tioneti milisinin 1-ci və 2-ci süvari yüzlükləri; Bakursin kəndində Sığnaq drujinsının 4-cü yüzlüyü; Sığnaq və Telavidə yerli komandanın hissələri; Car Kalodasında Şirvan alayının rotası, yerli komanda və Qafqaz dağlı batareyasının bölüyü yerləşdirilmişdi.

Oktyabrın 18-də Kordan xəttindən general-mayor, knyaz Çavçavadzenin başçılığı altındakı hissələrin Nuxaya gətirilməsi ilə Çernomorsk alayının 4-cü və 8-ci xətti, 3-cü atıcı rotaları üsyançıların hücumunun gözləndiyi İlisu dərəsinin qarşısına, Qaxa yeridilir. Bu arada dağlılar növbəti dəfə Nuxa qəzasına enməyə cəhd edirlər. Oktyabrın 20-də böyük qüvvə ilə Axtıya gələn ansuxlu Şaqo Nuxa qəzasına enib Qarabulaq yaxınlığında rus hissələri ilə toqquşur və məğlub olaraq dağ mahalı vasitəsilə Ansuxa çəkilir.

Çavçavadzenin Nuxada olduğu müddətdə Vəndam dərəsinə rus hissələri dağlarda üsyançı qüvvələrin cəmləşməsinin şahidi olurlar. Oktyabrın 29-da knyaz Orbeliani xəbər verir ki, dağlı üsyançı dəstəsi İlisu dərəsindəki Sarıbaş kəndini tutaraq Zaqatala dairəsinə girməyə hazırlaşır. Eyni vaxtda Yelizavetpol qubernatoru Mamatsev də ansuxlu Şaqo və axtılı Teyyub bəyin başçılığı altındakı üsyançı dəstənin Nuxa qəzasına girməyə hazırlaşması barədə məlumat alır. Bu məlumatı yoxlamaq məqsədilə növbəti günü knyaz Orbeliani Qaxdan Çernomorsk alayının iki rotası, süvari bölüyü və Qax milisinin iki yüzlüyündən ibarət qüvvəni İlisu dərəsinə göndərir. Burada toplar və mühafizə dəstəsi qoyaraq qalan hissələrə Sarıbaşa doğru hərəkət etmək əmrini verir.

Üsyançılar rus hissələrinin avanqardına-Çernomorsk alayının ovçuları və süvari milis hissələrinə kəndə girməyə imkan

verərək, onlara evlərin damları və ətrafdakı yüksəkliklərdən atəş açmağa başlayırlar. Bu zaman yerli milisin bir hissəsi də üsyançıların tərəfinə keçir. Atışaraq geri çəkilən ruslar yalnız qaranlığın düşməsi ilə Qaxa dönə bilirlər. Bu döyüşdə ruslardan üç nəfər yaralanır. Bundan sonra üsyançılar İlisunu tuturlar.

Üsyanın genişlənməsinin qarşısını almaq məqsədilə təcili tədbirlər görülür. Bu məqsədlə həmin günü, oktyabrın 30-da Mamatsev tərəfindən Yelizavetpol yerli batalyonunun 1-ci və 4-cü rotası, Şuşa yerli batalyonunun 2-ci rotası, Nuxa yerli komandası, Labinsk alayının 1-ci və 4-cü yüzlükləri, Xopersk kazak alayının yüzlüyü, Kuban kazak alayının 4-cü süvari batareyasının bir bölüyündən ibarət Nuxa dəstəsi təşkil olunur. Nuxa süvari drujinasının 4-cü yüzlüyü Samur dairəsi ilə sərhəddəki mühafizə məntəqələrində yerləşdirilir. Bununla bərabər o, knyaz Orbelianiyə Nuxaya əlavə kömək göndərməyi də təklif edir.

Oktyabrın 30-da axşam Mamatsev Samur dairəsinin Burcu və Xnov kəndlərində toplaşmış 4 min nəfərlik üsyançı dəstənin Şin dərəsindən keçərək Şin və Baş Göynük kəndlərinə daxil olması barədə məlumat alır. Üsyançıların kəndə daxil olması ilə Baş göynüklülər onlara qoşulur. Onlar kənddəki teleqraf xətlərini sıradan çıxarıb poçt atlarını və stansiya evini ələ keçirirlər.

Dağlıların Nuxa qəzasına girməsi ilə əlavə olaraq aşağıdakı müdafiə tədbirləri görülür: Yerli əhaliyə nəzarət etmək məqsədilə Yelizavetpol yerli batalyonunun 1,5 rotasının yerləşdiyi Aşağı Göynük kəndinə Nuxadan Labinsk kazak alayının iki yüzlüyü və 4-cü kazak batareyasının bir bölüyü də gətirilir. Aşağı Göynükdəki Yelizavetpol batalyonunun komandiri, podpolkovnik Şimanovskiyə Nuxanı üsyançılardan qorumaq və üs-

yançı dəstələrin hərəkətini daha yaxşı izləmək üçün bu qüvvələrlə Qoxmuq düzünə çəkilmək əmr olunur. Zaqataladan iki topla təchiz olunmuş üç piyada rotanı gətirməklə Yelizavetpol quberniyasındakı səhra hissələrini daha da gücləndirmək qərara alınır.

Beləliklə, artıq yuxarıda qeyd olunduğu kimi dağlıların Nuxa qəzasına daxil olması burada üsyanın başlanmasını tezləşdirir. İlk olaraq üsyana başlayan baş göynüklülər ətraf kəndlərin əhalisini də üsyana qaldıra bilirlər. Nəticədə bütövlükdə bölgədə son dərəcə təhlükəli vəziyyət yaranır. Belə ki, Baş Göynük və ətraf kəndlərin üsyana qalxması, eyni zamanda onlara dağlıların da qoşulması ilə burada vəziyyət o dərəcədə gərginləşir ki, Aşağı Göynükdə olan polkovnik Şimanovski Yelizavetpol qubernatorunun göstərişinə əsasən sərəncamındakı Yelizavetpol batalyonunun taqımı və polis yarımtaqımı ilə geri çəkilməyə məcbur olmuşdu.

Oktyabrın 31-i səhər tezdən Göynüyə yaxınlaşan kazak yüzlükləri səhər saat 6-da buradakı 1,5 piyada rota ilə birlşərək Nuxa istiqamətinə çəkilməyə başlayır. Lakin Göynüyün yeddi verstliyində rus hissələri Baş Göynük, Aşağı Göynük, Layısqı və Baş Şabalıd kəndlərinin üsyançı dəstəsi tərəfindən mühasirəyə alınır. Top və tüfəng atəşləri ilə üsyançılardan qorunan Şimanovski döyüşə-döyüşə çəkilməyə başlayır. Bundan xəbər tutan Mamatsev Yelizavetpol yerli batalyonunun rotası, Nuxa yerli komandasının bir hissəsi, Nuxa süvari drujinasının yüzlüyündən ibarət qüvvəni şəhərin yaxınlığındakı Kiş çayında ehtiyatda saxlayaraq, Şuşa yerli batalyonunun rotası, Xopersk kazak alayının yüzlüyündən ibarət qüvvə ilə Göynük yaxınlığında mühasirəyə düşmüş Şimanovskinin köməyinə tələsir. Onlar Nuxanın səkkiz verstliyində birləşirlər. Şimanovskini təqib

edən üsyançılar İnçə kəndinə girərək yüksəklikləri tuturlar. Qarabulağa yaxınlaşan ruslar top atəşləri ilə üsyançıları buradan çıxarda bilsələr də sonuncuların bir hissəsi dağlara çəkilir, 300 atlıdan ibarət digər hissəsi isə Yelizavetpol istiqamətində hərəkət edir. Bu dəstəni təqib edən Labinsk alayının kazak dəstəsi 200-ə yaxın üsyançını sıradan çıxara bilir. Üsyançıların İnçə və Qoxmuq dağlarında toplaşmış hissələri tərəfindən Oxud və Kişi keçərək Nuxanı ələ keçirmək təhlükəsi olduğundan Mamatsev Qoxmuq düzü istiqamətində hərəkət edir. Ətrafdakı yüksəklikləri ələ keçirmək istəyən üsyançı dəstə rusların top atəşləri qarşısında geri çəkilərək dağlarda mövqe tutmaq məcburiyyətində qalır. Qaranlığın düşməsi ilə tərəflər arasındakı atışma kəsilir və Mamatsev Nuxanı üsyançıların gecə hücumundan qorumaq üçün yenidən Kiş çayına tərəf çəkilir.

Həmin gecə casusların gətirdiyi xəbərdə sayı artaraq 8 minə çatmış üsyançıların müxtəlif istiqamətlərdən Nuxaya hücum etmək niyyətlərinin olduğu bildirilirdi. Belə ki, Baş Göynükdə möhkəmlənən Şaqonun 8 minlik dəstəsi Quba qəzası ilə Zaqatala dairəsi üsyançılarının birləşməsinə yol verməmək məqsədilə əsas rus qüvvələrinin toplaşdığı Nuxanı tutmağa hazırlaşırdı. Rusların ifadəsi ilə desək “20 minlik etibarsız tatar əhalisi olan Nuxa üçün yaranmış təhlükəli vəziyyətdə“ Mamatsev şəhəri hər tərəfdən mühafizə məntəqələri ilə əhatə etməklə şəhərin erməni əhalisinə də silah paylayır. Lakin gecə ərzində üsyançı dəstələr bir-neçə dəfə şəhərə yaxınlaşsalar da, hər dəfə rusların mühafizə məntəqələri ilə qarşılaşaraq, buradakı hissələrin Zaqataladan gətirilmiş əlavə qüvvələrlə gücləndirildiyini güman edərək şəhərə həlledici hücumdan vaz keçirlər.

Noyabrın 1-də Mamatsev Kiş çayında kiçik ehtiyat dəstəsi qoyub əsas hissələri yenidən Qoxmuq düzünə çəkir. Gün ərzin-

də üsyançılar bir-neçə dəfə hücuma keçsələr də, müvəffəqiyyət qazana bilmirlər. Həmin gün axşama doğru dağlı dəstəsinin Şin dərəsi ilə Samur dairəsinə çəkilməsi, yerli üsyançıları çətin vəziyyətdə qoyur və onlar dağlarda gizlənməyə məcbur olurlar.

Həmin vaxtı Qaxda da həyəcanlı vəziyyət qalmaqda davam edirdi. Mamatsev Nuxada yaranmış təhlükəli vəziyyətlə əlaqədar Qaxdakı Çernomorsk alayının üç rotası və bir süvari bölüyündən ibarət qüvvənin Nuxaya göndərilməsi barədə əmr verir. Qaxa isə oktyabrın 31-də polkovnik Şkurinskinin başçılığı altında Zaqataladan Şirvan alayının rotası, Çernomorsk alayının 12-ci rotası, Tiflis yerli alayının 14-cü və 15-ci rotaları, Zaqatala yerli batalyonunun rotası, Kuban süvari batareyasının 4-cü bölüyü və kazak yüzlüyündən ibarət qüvvə göndərilir. Lakin Mamatsevin Qaxdakı hissələrin komandiri kapitan Sakminə Nuxaya yardıma gəlmək barədə verdiyi əmrə baxmayaraq o, İlisu dərəsində mövqe tutmuş üsyançılar tərəfindən olan təhlükə qarşısında Qaxı tərk etməmiş, yalnız noyabrın 1-də Şkurinskinin başçılığı altındakı hissələrin Qaxa doğru hərəkətə başlaması barədə xəbər aldıqdan sonra Nuxaya getmişdi.

Sakminin Nuxaya yola düşməsi ilə İlisu dərəsindən enən üsyançılar kəndə yaxınlaşan Şkurinskinin dəstəsi ilə toqquşaraq geri çəkilməyə məcbur olurlar.

Bu arada qeyd etmək lazımdır ki, öldürülmüş üsyan iştirakçısının üstündən tapılmış məktublardan bəlli olur ki, üsyançıların geniş fəaliyyət planı var idi. Şaqo ilə Həsən arasında getmiş yazışmalara görə İlisu dərəsində mövqe tutmuş Kosrodo naibi Həsənin əsas vəzifəsi Şaqo tərəfindən Nuxanın tutulmasına kimi Qax üçün təhlükə törətməklə rus komandanlığını qüvvələrin bir hissəsini Qax istiqamətində cəmləşdirməyə məcbur etmək idi. Sonra isə Həsən özünün 2500 nəfərlik dəstəsi ilə no-

yabrın 2-də Qaxa hücum edərək onu ələ keçirməli, əgər bu mümkün olmazdısa, Qaxdan yan keçərək ümumi planın həyata keçirilməsi üçün Şaqo ilə birləşməli idi. Bundan sonra birləşmiş qüvvələrlə Qaxı və Nuxanı ələ keçirib Zaqatala dairəsi və Yelizavetpol quberniyasının müsəlman əhalisini hamılıqla üsyana qaldıraraq ümumi sayı 20-30 minə çatacaq qüvvə ilə Kaxetiyaya girməli idilər.

Zaqatala dairə rəisinin noyabrın 1-də verdiyi məlumatdan bəlli olur ki, artıq İlisu kəndinin əhalisi üsyançılara qoşulub, onlar Muxax dərəsindən keçməklə Balakən və Katexə hücum etmək niyyətindədirlər. Üsyançıları qabaqlamaq məqsədilə Şkurinski Qaxda 200 nəfərlik dəstə saxlayaraq, sayı 600-ü keçən 2 topla təchiz olunmuş qalan qüvvələrlə İlisuya hərəkət edir.

Hər iki tərəfdən üsyançılarla əhatələnmiş ensiz dərə ilə irəliləyən rus hissələrinin hərəkətini asanlaşdırmaq məqsədilə Şkurinski hər biri 60 nəfərdən ibarət olan ön dəstələr hazırlayaraq irəli göndərir. Kəndə yaxınlaşan həmin hissələr üsyançılar tərəfindən şiddətli atəşlə qarşılanır. Əlbəyaxa döyüşə girən ruslar əvvəlcə yüksəklikləri ələ keçirməyə nail olur, ardınca isə kəndi tuturlar. İlisu kəndində baş verən bu döyüşdə üsyançılar 150 nəfər itki verirlər.

Bu arada isə Göynüyə doğru hərəkət edən kapitan Sakmin Qarabulaq kəndi yaxınlığında üsyançılar tərəfindən mühasirəyə alınır. Üsyançıların gün ərzində və gecə boyu rusların üzərinə olan həmlələrinin, eləcə də süngü davasına girmək üçün etdikləri cəhdlərin qarşısı aramsız top atəşləri ilə alınır. Nəticədə düzən əraziyə çıxmağa müvəffəq olan rus dəstəsi kare şəklində düzülərək səhərə kimi müdafiə vəziyyətində qalır. Səhərin açılmasından sonra üsyançılarla atışa-atışa hərəkəti davam etdirən

rus dəstəsi onlara köməyə göndərilmiş Nuxa dəstəsinin yardımı ilə həmin günü şəhərə çata bilir.

Geri çəkilən üsyançıların təqib olunması məqsədilə Mamatsev noyabrın 2-də Nuxa drujinasının süvari yüzlüyü və kazak dəstəsini göndərir. Üsyanda iştirak etmiş kəndlərin sakinlərinin cəzalandırılması və üsyanın qalıqlarının tamamilə aradan qaldırılması məqsədilə isə noyabrın 4-də Nuxadan podpolkovnik Şimanovskinin başçılığı altında iki topla təchiz olunmuş üç piyada rota və iki kazak yüzlüyündən ibarət dəstə göndərilir. Şimanovski noyabrın 4-dən 15-ə kimi bu dəstə ilə üsyanda iştirak etmiş 13 kənddə axtarış apararaq üsyanın əsas günahkarlarını həbs edir, onların evlərinə od vurur, əhalidən silahları toplayaraq geri qayıdır.

Bu arada noyabrın 5-də Molla Abdulla Əfəndinin başçılığı altındakı üsyançı dəstənin Nuxa qəzasına girmək üçün etdiyi sonuncu cəhd də uğursuz olur.

Sənədlərdə 1877-ci il Nuxa üsyanı zamanı hökumət qüvvələri ilə döyüşlərdə 200-dən 300-ə qədər üsyançının öldürüldüyü göstərilir. Yelizavetpol qubernatoru, general-leytenanat Mamatsevin yazdığına görə "…dağlılar və Nuxa qəzasının 12 kəndinin üsyançı dəstələri ilə üç günlük döyüşdən sonra düşmən məhv edilmiş, üsyançılardan 300 nəfər öldürülmüş, ondan iki dəfə çoxu yaralanmış, çoxsaylı əsir götürülmüşdür.

Nuxa qəzasının kəndlərində aparılmış axtarışların nəticəsi olaraq müəyyən olunur ki, qəzanın Baş Göynük kəndinin 384, Aşağı Göynük kəndinin 280, Biləcik kəndinin 200, Şin kəndinin 110, İnçə kəndinin 109, Baş Layısqı, Aşağı Layısqı, Birinci Cunud və ikinci Cunud kəndlərinin 311, Baş Şabalıd və Aşağı Şabalıd kəndlərinin 208, Zunud və Mirzəbəyli kəndlərinin 158, Qarabulaq, Qoxmuq və Oxud kəndlərinin 252 sakini üsyana

qoşulmuşdu.

Nuxa həyəcanlarında təqsirli bilinərək həbs olunmuş üsyan iştirakçıları arasında da baş göynüklülər çoxluq təşkil edirdi. Sənədlərdə Nuxa təcridxanasında saxlanılan üsyan fəalları arasında Baş göynüklülər Hacı Əhməd Ağa Hacı Xancanbəyov, Yunis Hacı Yusif oğlu, Hacı Həmid Hacı Həsən oğlu (o, 1863-cü il üsyanının da fəallarından olmuşdur-Ə.M), Hacı İbrahim Abdulla oğlu, Əbdülrəhman Çələbi oğlu, Aslan Cavad oğlu, Kərim Kərim oğlu, Novruz İman oğlu, Balabəy İsgəndər oğlu, Qəhrəman Aslan oğlu, İsmayıl Hacıəli oğlu, Əziz Laçın oğlu, İbah Babaş oğlu, Rizvan Məmməd Saad oğlu, Əzim Mustafa oğlu, Yusif Əbdülrəhman oğlu, Kərim Salman oğlu, aşağı göynüklülər Molla Məmməd Hacı Süleyman Əfəndi oğlu, Məmmədxalaç Məmmədrüstəm oğlu, Manaf Qubad oğlu, Əhməd Mahmud oğlu, Məmməd Abdulla oğlu, Mustafa Məmməd oğlu, Molla Nəcəf Molla Bala oğlunun da adları qeyd olunur. Bu kəndlilərin hamısını ciddi cəzalar gözləyirdi. Nuxa qəzasında aparılmış repressiv cəza tədbirləri nəticəsində bir çox ailələr başsız qalmış, çoxlu evlər yandırılmış, üsyan iştirakçılarının demək olar ki, hamısı sürgünə, katorqaya göndərilmişdi.

Yerlərdə əhalinin tərksilah edilməsi üçün xüsusi layihənin hazırlanması nəzərdə tutulmuşdu. Layihə müəllifi olan Bakı qubernatorunun fikrincə bu tədbir sonuncu rus-türk müharibəsi zamanı üsyan etmiş bütün bölgələrə şamil edilməli idi.

1877-ci il üsyanlarının səbəbləri barədə Yelizavetpol qubernatoru çarizmin yerli əhaliyə münasibətdə yeritdiyi ayrı-seçkilik siyasətini etiraf edərək yazırdı: “Mən belə qənaətə gəlmişəm ki, hər bir xalqa onun inkişafı üçün lazımi vəsait verilsə, onun iqtisadi vəziyyətinə qayğı göstərilsə, onda bu cür qayğıkeşliyin nəticəsi olaraq, əhali hökumətə sadiq qalar, onun bütün

tədbirlərinə müti olar və nə fanatik, nə də siyasi həyəcanlara qoşulmaz”.

XIX əsrin ən böyük işğalçı dövləti olan Çar Rusiyası Cənubi Qafqazı tamamilə ilhaqa məruz qoysa da, Azərbaycanda heç cür möhkəmlənə bilmədi. Demək olar 100 il səksəkə, həyəcan, üsyan, qan-qada Çar Rusiyasının Cənubi Qafqazda-daha dəqiqi Azərbaycanda izləmək məcburiyyətində qaldığı səhnələr oldu. Azərbaycanın Şimal-qərb bölgəsi, ələlxüsus da Göynük mahalı və Car-Balakən Çar Rusiyasının qorxulu röyasına çevrildi…

XX əsrin 20-ci ilində də Baş Göynük Çar Rusiyasının xələfi olan bolşevik Rusiyasının da qanını qaraltmaqda davam etdi. Azərbaycan Xalq Cümhuriyyətini devirib sosialist Azərbaycanı yaradaraq özünə tabe edən bolşevik Rusiyasının Azərbaycan ərazisində törətdiyi vəhşiliklər, insanlıq adına yaraşmayan hərəkətlər yerli xalqda haqlı olaraq narazılığa səbəb olurdu.

Azərbaycanı işğal etmiş XI Qırmızı Ordunun vəhşiləşmiş əsgər və zabitləri Nuxa qəzasında əhaliyə divan tuturdular. Bu isə xalqın ayağa qalxaraq yad rejimi devirməsi üçün əsas verirdi.

**“Göynük Hərəkatı (1805-1930-cu illər)” kitabından:**

-Nuxa qəzasında əhaliyə qarşı həyata keçirilən cəza tədbirləri iyunun əvvəllərindən burada üsyanın yenidən alovlanmasına səbəb olur. Qızıl Ordu qərargahından verilən operativ məlumatlardan bəlli olur ki, bu zaman Nuxa qəzasındakı üsyanın mərkəzi Baş Göynük idi.

Arxiv sənədlərində həmin vaxtı Baş Göynük, Baş Şabalıd və Aşağı Şabalıd kəndlərindəki üsyançı qüvvələrin sayının 700 nəfərə çatdığı qeyd olunurdu. Nuxa qəza hərbi komissarı Əsgə-

rov və səfərbərlik şöbəsinin rəisi Puçkovun hazırladıqları "Göynük rayonunun siyasi-iqtisadi xarakteristikası"nda da bu rayonun 1920-ci il üsyanında yaxından iştirak etdiyi göstərilirdi.

Buna görə də əlavə yardım gələnə kimi üsyançıların irəliləməsinin qarşısının alınması barədə verilən xüsusi göstərişdə Nuxa qəzasındakı üsyan mərkəzi olan Baş Göynüyün tutulmasının son dərəcə vacibliyi vurğulanırdı. Bu məqsədlə 7-ci Qafqaz diviziyasının komandiri Xmelnikova üç alayla üsyançıların hərəkətinin qarşısını Şin çayında almaq, buradakı Qızıl Ordu hissələrinin sağ cinahının təhlükəsizliyinin təmin edilməsi məqsədilə Baş Göynüyü tutmaq, bununla da dağlardakı əsas yüksəklikləri ələ keçirmək əmr olunurdu…

… Üsyançılar da öz növbəsində mövqelərinin möhkəmləndirilməsi üçün müəyyən tədbirlər görürlər. Belə ki, iyunun 11-də onların çoxsaylı qüvvələri (onlardan 1000 nəfəri süvari idi- Ə.M.) tərəfindən Qızıl Ordu hissələri Yuxarı Malax, Əmbərçay istiqamətinə sıxışdırılsalar da, üsyançılar bundan sonra hücumu davam etdirməyərək ələ keçirdikləri mövqeləri möhkəmləndirməklə məşğul olurlar.

Qızıl Ordu komandanlığından verilən 15 iyun tarixli əmrdə də üsyançıların Qaxingiloy, Almalı və Əlibəyli istiqamətindəki mövqeləri möhkəmləndirdiyi, əsas cəbhə xəttinin Şin çayı boyunca yerləşdiyi üsyançı qüvvələrin sağ cinahının Qıpçaq, sol cinahının isə Baqqal-Cunut dağları boyunca uzandığı bildirilirdi. Əmrdə üsyan başçıları tərəfindən hələ iyunun 9-da onların nəzarətində olan kəndlərdə 15-66 yaşlı əhalinin səfərbərliyini keçirdiyi qeyd olunurdu.

Üsyançıların Baş Layısqı və Baş Göynük arasındakı dərədə mövqe tutan qüvvələrinin sayı 300, Göynük, Aşağı Şabalıd

və Baş Şabalıdda isə 400 nəfərə çatdığı göstərilirdi. Sənədlərdən bəlli olur ki, üsyançıların sıralarında milli ordunun keçmiş əsgər və zabitləri var idi. Samuxdan Hacıbala bəyin başçılığı altında iki pulemyotla silahlanmış süvari dəstə də üsyançıların qərargahının yerləşdiyi Əlibəyli kəndinə gəlmişdi. Eyni zamanda üsyan rayonunda nuxalı zabit Məmməd bəyin başçılıq etdiyi 300 nəfərlik dəstənin də fəaliyyət göstərdiyi bildirilirdi.

Üsyançıların kifayət qədər güclü mövqelərə malik olduğu qırmızı ordu komandanlığı tərəfindən də etiraf olunurdu. Qızıl Ordu komandanlığının iyunun 14-nə olan operativ məlumatında bununla bağlı deyilirdi: "Rəqib başlıca olaraq Baş Göynük və Baş Şabalıd rayonunda güclüdür. Hal-hazırda bizimkilər 38-ci kommunist dəstəsi və 39-cu alayın hissələri ilə həmin rayonda rəqibi məğlub etməyə çalışır. Lakin mövqenin əlverişsiz olması səbəbindən hələlik müvəffəqiyyət qazana bilmirlər. 37-ci Qafqaz alayı geri çəkilib. Atışma gedir".

Həmin gün qırmızı hissələrin Baş Göynük kəndini tutmaq üçün etdiyi cəhdin qarşısı üsyançı dəstə tərəfindən alınır. Üsyançılar qırmızı hissələrin hücumlarını mərdliklə dəf edirlər. Qızıl Ordu komandanlığından verilən məlumatda bu döyüş zamanı Göynük üsyançılarının itkilərinin 60-70 nəfər olduğu göstərilirdi. Bununla belə onlar Göynük uğursuzluğunun səbəbini dağlıq ərazidə süvari hissələrin hərəkətinin çətinliyi, əməliyyatı uğurla başa çatdırmaq üçün ayrılmış piyada qüvvələrin yetərli olmaması kimi bəhanələrlə izah etməyə çalışırdılar.

Tərəflər arasında həlledici döyüş iyun ayının 15-də baş verir. Qızıl Ordu komandanlığının yuxarıda göstərilən məlum əmrində döyüşün nəticəsi olaraq həmin gün axşam saat 6-da üsyan mərkəzi olan Baş Göynük və Baş Şabalıd kəndlərinin tutulduğu bildirilirdi.

Kəndin alınmasından sonra Xmelkovun başçılığı altında 7-ci Qafqaz diviziyasının hissələri Baş Göynükdə yerləşdirilir. Ətraf kəndlərə çəkilərək müqaviməti davam etdirən Baş Göynük üsyançılarının nəzarətində olan bu mövqelərin də ələ keçirilməsi məqsədilə II atlı korpusunun komandiri Todorkinin komandanlığı altında 13 topla təchiz olunmuş 9 batalyon, 4 eskadrondan ibarət qüvvələr iyunun 16-da Baş Göynükdə mövqe tutmuş Xmelkovun Qafqaz diviziyasını əvəz etməli, bundan sonra Biləcik, Əmbərçay, Qaxingiloy istiqamətində hərəkət etməklə Şin kəndinə nəzarəti ələ keçirməli, İlisuya hərəkət edib dağlara gedən yol və cığırları tutmalı idi. Qafqaz diviziyasının komandiri Xmelkova isə sərəncamındakı 4 topla təchiz olunmuş 12 eskadron qüvvə ilə iyunun 17-i səhər tezdən Aşağı Göynükdə mövqe tutmaq, müqavimət göstərənləri amansızlıqla məhv etmək, təslim olanları tərksilah edərək arxaya göndərmək əmr olunmuşdu…

Üsyanın məğlubiyyətinə baxmayaraq, onların Azərbaycanın istiqlal savaşı tarixində xüsusi yeri olmuşdur. Bu üsyanlar Azərbaycan xalqının kütləvi mübarizə əzminin ölmədiyini, lazım gəldikdə onu göstərməyə qadir olduğunu bir daha sübut etdi…

1930-cu il üsyanı göynüklülərin XX əsrdə zorən yaradılmış sovet quruluşuna qarşı qaldırdıqları son üsyan oldu. Bu üsyan barədə kifayət qədər yazıldığı üçün biz təkrarçılığa yol vermək istəmirik. Amma onu bilmənizi istəyirik ki, 1930-cu il üsyanı masştabına və siyasi çəkisinə görə daha möhtəşəm olmuşdur…

*** 

Göynük mahalının kişiləri 1941-1945-ci il müharibəsi zamanı da kənarda qalmamışlar.

Birinci Qarabağ müharibəsində də bölgəmizin yüzlərlə gənci könüllü olaraq, torpaqlarımızın təhlükəsizliyi və ərazi bütövlüyümüz uğrunda silaha sarıldı. Onlardan yüzə yaxını Şəhidlik məqamına yüksəldi. Bir sözlə, Göynük mahalı qoynunda ancaq qəhrəmanlar yetişdirir və müqəddəs savaşlarda bu qəhrəmanlar öz sözlərini deməyi bacarırlar. İkinci Qarabağ müharibəsində olduğu kimi…



**Mayor**
**Xəyal Ağabəy oğlu**
**MƏMMƏDOV**

18 noyabr 1986-cı ildə Şəki şəhərində anadan olmuşdur (əslən Baş Göynükdəndir). 1993-2001-ci illərdə Şəki şəhər 5 saylı tam orta məktəbində, 2001-2004-cü illərdə Cəmşid Naxçıvanski adına Hərbi liseydə, 2004-2008-ci illərdə isə Heydər Əliyev adına Ali Hərbi Məktəbdə təhsil almışdır. Bir-neçə xarici ölkədə təlimlərdə iştirak etmişdir.

X.A.Məmmədov İkinci Qarabağ müharibəsi zamanı Ermənistan Respublikasının işğalı altında olan Cəbrayılın, Hadrut qəsəbəsinin, Füzulinin, Zəngilanın azad edilməsi uğrunda gedən döyüşlərdə iştirak etmişdir. 2020-ci il oktyabrın 20-də Qubadlı istiqamətində gedən döyüşlər zamanı snayper gülləsi nəticəsində ŞƏHİD olmuşdur.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə X.A.Məmmədov ölümündən sonra "Vətənə xidmətə görə" 3-cü dərəcəli ordeni və "Cəbrayılının, Qubadlının" azad olunmasına görə medallarıyla təltif edilmişdir.

Ailəli idi, iki övladı bizlərə əmanət qalmışdır.

Şəki şəhərində dəfn edilmişdir.

**Əhməd Teymur oğlu HACIYUSİFOV**



23 iyun 2001-ci ildə Şəki rayonunun Baş Göynük kəndində anadan olmuşdur. 2007-2018-ci illərdə Baş Göynük kənd 2 saylı tam orta məktəbində təhsil almışdır. 2019-cu ilin iyul ayında həqiqi-hərbi xidmətə çağırılmışdır.

Ə.T.Hacıyusifov İkinci Qarabağ müharibəsi zamanı Füzuli, Cəbrayıl və Qubadlı rayonlarının erməni quldurlarından azad olunması uğrunda gedən döyüşlərdə iştirak etmişdir. 2020-cil noyabrın 8-i onun son döyüş günü oldu. Şuşa şəhərinin erməni işğalçılarından təmizlənməsi zamanı Əhməd Teymur oğlu Hacıyusifov ŞƏHİDlik məqamına yüksəldi.

Baş Göynük kənd qəbristanlığında dəfn edilmişdir.

Ə.T.Hacıyusifov Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə ölümündən sonra “Vətən uğrunda” və “Füzulinin azad olunmasına görə” medallarıyla təltif edilmişdir.

**Rəşadət Vüqar oğlu MUSAYEV**




20 iyun 2002-ci ildə Şəki rayonunun Baş Göynük kəndində anadan olmuşdur. 2008-2019-cu illərdə Baş Göynük kənd 1 saylı tam orta məktəbində təhsil almışdır. 2020-ci ilin iyul ayında həqiqi-hərbi xidmətə çağırılmışdır.

R.V.Musayev İkinci Qarabağ müharibəsi zamanı Füzuli və Qubadlının erməni quldurlarının işğalından azad olunması uğrunda gedən döyüşlərdə iştirak etmişdir. 2020-ci il oktyabrın 25-i onun son döyüş günü oldu. Xocavənd uğrunda gedən döyüşlər zamanı Rəşadət Vüqar oğlu Musayev ŞƏHİDlik məqamına yüksəldi. Ölümündən sonra Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Vətən uğrunda" və "Füzulinin azad olunmasına görə" medallarıyla təltif edilmişdir.

Baş Göynük kənd qəbristanlığında dəfn edilmişdir.



**Ehtiyatda olan tibb xidməti polkovnik-leytenantı Şahvələd Mahmud oğlu ABDULKƏRİMOV**

8 oktyabr 1964-cü ildə Şəki rayonunun Baş Göynük kəndində anadan olmuşdur. 1972-1982-ci illərdə Baş Göynük kənd tam orta məktəbində təhsil almışdır. 1982-1984-cü illərdə həqiqi-hərbi xidmətdə olmuşdur. 1985-1991-ci illərdə Azərbaycan Dövlət Tibb İnstitutunda təhsil almışdır. 1992-ci ildə-Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsinin müharibəyə çevrildiyi gündən vətənimizin çağırışına səs verərək hərbi həkim kimi fəaliyyətə başlamışdır.

Ş.M.Abdulkərimov 1992-ci ildən 2017-ci ilə kimi fasiləsiz olaraq, erməni gülləsinə tuş gəlmiş minlərlə oğullarımızın sağalaraq yenidən həyata qayıtmalarını təmin etmişdir. 2017-ci ildə təqaüdə çıxmış, lakin mülki həkim kimi yenə də əsgər və zabitlərimizin sağlamlığının keşiyində durmuşdur. 2016-cı il aprel döyüşlərində və 44 günlük Vətən müharibəsində də o, bilik və bacarığını igid əsgərlərimizdən əsirgəməmişdir. Onun xidməti Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyev tərəfindən həmişə yüksək qiymətləndirilmişdir. Belə ki, o, ayrı-ayrı vaxtlarda "III, II və I dərəcəli Qüsursuz xidmətə görə" "10 illik yubiley", "Silahlı Qüvvələrin 90, 95,100 illik yubileyi" və "Silahlı Qüvvələrin veteranı" medalları ilə təltif edilmişdir.

Ailəlidir, iki övladı var.

**Baş leytenant**
**Habil Şahid oğlu BABAYEV**



22 oktyabr 1974-cü ildə Şəki rayonunun Baş Göynük kəndində anadan olmuşdur. 1981-1992-ci illərdə Baş Göynük kənd 2 saylı tam orta məktəbində, 1991-1996-cı illərdə isə Bakı Dövlət Universitetinin Coğrafiya fakültəsində təhsil almışdır. 1996-2000-ci illərdə zabit kimi həqiqi-hərbi xidmətdə olmuşdur. 2000-ci ildən Baş Göynük kənd 2 saylı tam orta məktəbində coğrafiya müəllimi kimi pedaqoji fəaliyyətə başlamışdır. 2016-cı ildən 2 saylı tam orta məktəbin direktor müavini vəzifəsində çalışır.

H.Ş.Babayev "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmış, Ağcabədi, Qubadlı, Zəngilan, Cəbrayıl istiqamətlərində gedən döyüşlərdə iştirak etmişdir. Nümunəvi xidmətlərinə görə hərbi hissə komandiri tərəfindən fəxri fərmanla təltif olunmuşdur.

Ailəlidir, iki övladı var.

**Baş leytenant**
**Aqil Arif oğlu HÜSEYNOV**

12 noyabr 1978-ci ildə Şəki rayonunun Baş Göynük kəndində anadan olmuşdur. 1986-1996-cı illərdə Baş Göynük kənd 2 saylı tam orta məktəbində, 1996-2000-ci illərdə Bakı Dövlət Universitetinin Coğrafiya fakültəsində təhsil almışdır.

Bakı Dövlət Universitetini ehtiyatda olan kiçik leytenant kimi bitirən A.A.Hüseynov 2001-2003-cü illərdə həqiqi-hərbi xidmət keçmişdir. 2001-ci ildə Baş Göynük kənd 1 saylı tam orta məktəbində coğrafiya müəllimi kimi pedaqoji fəaliyyətə başlamışdır.

“Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı” ilə İkinci Qarabağ müharibəsinə qatılmışdır.

Azərbaycan Respublikası Müdafiə Nazirinin əmri ilə A.A.Hüseynov 2020-ci ilin dekabr ayında baş leytenant rütbəsi ilə təltif edilmişdir.

Ailəlidir, iki övladı var.

**Baş leytenant**
**Mehman Oruc oğlu**
**MƏMMƏDOV**




30 mart 1980-ci ildə Şəki rayonunun Baş Göynük kəndində anadan olmuşdur. 1986-1997-ci illərdə Baş Göynük kənd 1 saylı tam orta məktəbində, 1997-2001-ci illərdə Azərbaycan Dövlət Neft Akademiyasının (ADNA) Avtomatika fakültəsində təhsil almışdır. ADNA-da hərbi kafedra olduğu üçün M.O.Məmmədov ehtiyatda olan kiçik leytenant rütbəsi almış və 2001-ci ildə həqiqi-hərbi xidmətə yollanmışdır. 2003-cü ildə hərbi xidmətdən tərxis olunmuşdur. 2006-cı ildə Heydər Əliyev adına Neft Emalı Zavodunda mühəndis kimi əmək fəaliyyətinə başlamışdır.

“Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı” ilə İkinci Qarabağ müharibəsinə qatılmış, Füzuli, Cəbrayıl, Xocavənd uğrunda gedən döyüşlərdə iştirak etmişdir. Oktyabrın 22-də Xocavənd rayonundakı Ərgünəş dağında gedən qızğın döyüşlərdə başından yaralanmışdır. Həkimlərin səyi nəticəsində sağalaraq yenidən cəbhə xəttinə geri dönmüşdür. 30 dekabr 2020-ci ildə baş leytenanat rütbəsi ilə ehtiyata buraxılmışdır.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə “Füzulinin və Xocavəndin azad olunmasına görə” medallarıyla təltif edilmişdir.

Ailəlidir, iki övladı var.




**Sakit Nəriman oğlu**
**ASLANOV**

27 noyabr 1980-ci ildə Şəki rayonunun Baş Göynük kəndində anadan olmuşdur. 1988-1999-cu illərdə Baş Göynük kənd 2 saylı tam orta məktəbində təhsil almışdır. 1999-2001-ci illərdə Təlim-Tədris Mərkəzində gizir hazırlıq kursunu bitirmişdir. 19 avqust 2002-ci ildən tağım komandirinin müavini kimi xidmətə başlamışdır. 2013-cü ildə xidmətdə fərqləndiyinə görə baş gizir rütbəsinə layiq görülmüşdür. 2013-cü ildə "Qüsursuz Xidmətə Görə" 3-cü dərəcə, 2014-cü ildə "Silahlı Qüvvələrin Yaranmasının 95 illiyi", 2016-cı ildə "Qüsursuz Xidmətə Görə" 2-ci dərəcə, 2019-cu ildə "Silahlı Qüvvələrin Yaranmasının 100 illiyi", 2020-ci ildə "Qüsursuz Xidmətə görə" 1-ci dərəcə medalları ilə təltif olunmuşdur.

Baş gizir S.N.Aslanov İkinci Qarabağ müharibəsində də fəal iştirak etmişdir. Gülüstan, Suqovuşan, Madagiz istiqamətlərində döyüşmüşdür. Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Suqovuşanın azad olunmasına görə" medalıyla təitif edilmişdir.

Ailəlidir, iki övladı var.

**Kapitan**
**Ağadadaş Hətəm oğlu**
**SALMANOV**



17 sentyabr 1983-cü ildə Şəki rayonunun Baş Göynük kəndində anadan olmuşdur. 1990-2001-ci illərdə Baş Göynük kənd 1 saylı tam orta məktəbində, 2001-2005-ci illərdə isə Bakı Ali Birləşmiş Ümumqoşun Komandirlər Məktəbində (indiki Heydər Əliyev adına Azərbaycan Ali Hərbi Məktəbində) təhsil almışdır.

2005-2006-cı illərdə Silahlı Qüvvələrin Təlim-Tədris Mərkəzində zabit ixtisas kursunu bitirdikdən sonra N saylı hərbi hissədə xidmətə başlamışdır.

Kapitan A.H.Salmanov xidməti dövründə bir çox medallarla təltif olunmuşdur. Onlardan “Silahlı Qüvvələrin 90, 95, 100 illik” yubiley medallarını, “Qüsursuz xidmətə görə” 2-ci dərəcəli medalını göstərmək olar. Ən son medalları İkinci Qarabağ müharibəsində iştiarakı zamanı almışdır. Belə ki, o, Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə “Füzulinin və Xocavəndin işğaldan azad olunmasına görə” və “Şücaətə görə” medallarıyla təltif edilmişdir.

Ailəlidir, iki övladı var.

## Ağabala Qulu oğlu QAFFAROV

18 dekabr 1983-cü ildə Şəki rayonunun Baş Göynük kəndində anadan olmuşdur. 1990-2001-ci illərdə Baş Göynük kənd tam orta məktəbində təhsil almışdır. 2002-2003-cü illərdə həqiqi-hərbi xidmətdə olmuşdur. 2010-cu ildə Silahlı Qüvvələrin Təlim-Tədris Mərkəzinin gizir hazırlığı kursuna qəbul olmuş, 2011-ci ildə həmin mərkəzi motoatıcı döyüş maşın komandiri ixtisası üzrə bitirmiş, gizir rütbəsi ilə N saylı hərbi hissəyə göndərilmişdir. 2018-ci ildə N saylı hərbi hissənin Artilleriya Divizionunun texniki vəzifəsinə təyin olunmuşdur.

A.Q.Qaffarov İkinci Qarabağ müharibəsinə qatılmış, Goranboy, Murovdağ silsiləsi, Kəlbəcər, Talış, Suqovuşan istiqamətlərində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Suqovuşanın azad olunmasına görə" medalıyla təltif edilmişdir.

Ailəlidir,iki övladı var.

**Polkovnik-leytenant**
**Tərlan Zabit oğlu**
**ABDURAHMANOV**



13 fevral 1984-cü ildə Şəki rayonunun Baş Göynük kəndində anadan olmuşdur. 1999-2001-ci illərdə Baş Göynük kənd 1 saylı orta məktəbində, 2001-2005-ci illərdə Heydər Əliyev adına Azərbaycan Ali Hərbi Məktəbinin artilleriya şöbəsində təhsil almışdır. 2006-cı ildə Təlim-Tədris Mərkəzində zabit hazırlığı kursunu bitirmiş və N saylı hərbi hissənin Artilleriya Diviziyasında taqım komandiri kimi xidmətə başlamışdır.

2009-cu ildən Artilleriya batareya kimandiri kimi xidmətini davam etdirir.

Azərbaycan Respublikası Silahlı Qüvvələrinin Baş Qərargah rəisinin müvafiq əmri ilə 2017-ci ilin 29 martında N saylı hərbi hissədə Özüyeriyən Artilleriya Diviziyasının komandiri vəzifəsinə təyin edilmişdir. 2019-cu il yanvar ayının 11-də Silahlı Qüvvələrin Baş Qərargah rəisinin müvafiq əmri ilə N saylı hərbi hissənin Artilleriya rəisi-bölmə rəisi vəzifəsinə təyin olunmuşdur. Hal-hazırda həmin vəzifədə xidmətini davam etdirir.

Polkovnik-leytenant T.Z.Abdurahmanov İkinci Qarabağ müharibəsində də nümunəvi iştirakçılardan olmuşdur. Talış-Suqovuşan istiqamətində döyüşmüşdür.

Azərbaycan Respublikasını Prezidenti, Ali Baş Koman-

dan İlham Əliyevin Sərəncamı ilə “Vətənə xidmətə görə” ordeni, “Qüsursuz xidmətə görə” 3-cü dərəcə, “Qüsursuz xidmətə görə 2-ci dərəcə, “Silahlı qüvvələrin 90,100 illiyi” medallarıyla təltif olunmuşdur.

Ailəlidir, dörd övladı var.

**Ulduz Mahmud qızı ABDULKƏRİMOVA**



22 sentyabr 1981-ci ildə Şəki rayonunun Baş Göynük kəndində anadan olmuşdur. 1988-1998-ci illərdə Baş Göynük kənd 2 saylı tam orta məktəbində, 2002-2004-cü illərdə Şəki şəhər Tibb Texnikumunda təhsil almışdır. 2005-ci ildən hərbi tibb bacısı kimi xidmətə başlamışdır.

U.M.Abdulkərimova aprel döyüşlərində və 44 günlük Vətən müharibəsində yaralı əsgər və zabitlərimizin ən yaxın dostu olmuşdur.

Baş çavuş Ulduz Abdulkərimova "Silahlı Qüvvələrin 95 və 100 illik yubileyı" və "Qüsursuz xidmətə görə" 3-cü və 2-ci dərəcə medalları ilə təltif edilmişdir.



**Yamən Camal oğlu**
**HƏSƏNOV**

22 aprel 1984-cü ildə Şəki rayonunun Baş Şabalıd kəndində anadan olmuşdur. 1991-2002-ci illərdə Baş Şabalıd kənd tam orta məktəbində təhsil almışdır. 2002-2004-cü illərdə həqiqi-hərbi xidmətdə olmuşdur. 2013-cü ilin may ayından Azərbaycan Respublikası Daxili İşlər Nazirliyi, Daxili Qoşunların N saylı hərbi hissəsində müddətdən artıq xidmət edir.

Y.C.Həsənov İkinci Qarabağ müharibəsində Hadrut istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Ailəlidir, üç övladı var.

**Baş leytenant**
**Həsrət Hüseyn oğlu**
**HƏSƏNOV**



22 dekabr 1984-cü ildə Şəki rayonunun Baş Göynük kəndində anadan olmuşdur. 1991-2002-ci illərdə Baş Göynük kənd 1 saylı tam orta məktəbində, 2002-2006-cı illərdə Lənkəran Dövlət Universitetinin Psixologiya fakültəsində təhsil almışdır. 2006-2007-ci illərdə həqiqi-hərbi xidmətdə olmuş və leytenant kimi ehtiyata buraxılmışdır.

H.H.Həsənov "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmış, Cəbrayıl, Qubadlı və Xocalının müdafiəsində iştirak etmişdir. Azərbaycan Respublikası Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Qubadlının azad olunmasına görə" medalıyla təltif edilmişdir.

## Elman Vəliyullah oğlu ƏRƏBOV

2 yanvar 1983-cü ildə Şəki rayonunun Baş Göynük kəndində anadan olmuşdur. 1990-2001-ci illərdə Baş Göynük kənd 2 saylı tam orta məktəbində təhsil almışdır. 2002-ci ilin 16 yanvarından hərbi xidmətdədir.

E.V.Ərəbov İkinci Qarabağ müharibəsi zamanı Suqovuşan, Murovdağ, Şuşa istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Silahlı Qüvvələrin yaranmasının 90, 95, 100 illik yubiley", "Suqovuşan və Şuşanın azad olunmasına görə", "Cəsur döyüşçü" və "Qüsursuz Xidmətə görə" 3-cü, 2-ci dərəcə medallarıyla təltif edilmişdir.

**Baş leytenant**
**Nicat Cuma oğlu**
**MÜTTƏLİBOV**



5 may 1985-ci ildə Şəki rayonunun Baş Şabalıd kəndində anadan olmuşdur. 1991-2002-ci illərdə Baş Şabalıd kənd tam orta məktəbində, 2002-2006-cı illərdə isə Bakı Dövlət Universitetinin Mexanika-riyaziyyat fakültəsinin bakalavr pilləsində təhsil almışdır. 2006-2008-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur. 2012-2015-ci illərdə Gəncə Dövlət Universitetinin (magistr) Cəbr və topologiya fakültəsində oxumuşdur. 2009-cu ildən Şəki şəhər 3 saylı tam orta məktəbində müəllim kimi fəaliyyət göstərir.

N.C.Mütəllibov "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci iltarixli Sərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmış, Murov dağı və Suqovuşan istiqamətlərində döyüşmüşdür. Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə baş leytenant rütbəsinə layiq görülmüş, "Suqovuşanın azad olunmasına görə" medalıyla təltif edilmişdir.

## Rəşad Səfayıl oğlu ASLANOV

13 oktyabr 1985-ci ildə Şəki rayonunun Baş Göynük kəndində anadan olmuşdur. 1992-2003-cü illərdə Baş Göynük kənd 1 saylı tam orta məktəbində, 2003-2007-ci illərdə isə Gəncə Dövlət Universitetində təhsil almışdır. 2007-2009-cu illərdə N saylı hərbi hissədə tağım və bölük komandiri kimi xidmət etmişdir.

R.S.Aslanov "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmış, bölük komandiri kimi Füzuli, Cəbrayıl, Hadrut, Zəngilan, Qubadlı istiqamətlərində döyüşmüşdür.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Cəbrayılın, Zəngilanın, Qubadlının azad olunmasına görə" medallarıyla təltif edilmişdir.

R.S.Aslanov hal-hazırda inşaat mühəndisi kimi çalışır. Əvvəllər "Alov qüllələri", "İqamətgah" da daxil olmaqla bir çox dövlət əhəmiyyətli obyektlərin inşaasında rəhbər vəzifələrdə işləmişdir.

**Bəhruz Məmmədəli oğlu NƏSİBOV**



11 avqust 1986-cı ildə Şəki rayonunun Baş Göynük kəndində anadan olmuşdur. 1993-1994-cü illərdə Baş Göynük kənd 2 saylı tam orta məktəbində, 2006-2010-cu illərdə Azərbaycan Dövlət Dillər Universitetinin Filologiya fakültəsində təhsil almışdır. 2010-2012-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur. 2010-cu ildə öz ərizəsi ilə ehtiyat zabit kursunun dinləyicisi (leytenant) olmuşdur. 2013-2018-ci illərdə Daxili İşlər Nazirliyi Qax rayon Polis şöbəsində işləmişdir. Polis kapitanı rütbəsi ilə Daxili İşlər Nazirliyi sistemindən ayrılaraq, Şəki Regional "Asan Xidmət" mərkəzində aparıcı məsləhətçi kimi fəaliyyətə başlamışdır. Dövlət qulluqçusudur.

B.M.Nəsibov 2020-ci ilin avqust ayında könüllü şəkildə internet üzərindən qeydiyyatdan keçərək Qarabağda döyüşmək arzusunda olduğunu bildirmişdir. Sentyabrın 29-da Şəki rayon Səfərbərlik və Hərbi Xidmətə Çağırış Dövlət Xidmətinə çağırılmış, ancaq ixtisasına uyğun tələbat olmadığına görə geri qaytarılmışdır. Lakin o, israrla döyüş bölgəsinə getmək və döyüşmək istədiyini bildirmişdir. Nəhayət o, "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı"na əsasən İkinci Qarabağ müharibəsinə qatılmaq səadətinə nail olmuşdur. İlk olaraq cəbhənin Ağdam, sonra isə Qubad-

lı istiqamətində gedən döyüşlərdə iştirak etmişdir. Bölük komandirinin şəxsi heyətlə iş üzrə müavini vəzifəsində xidmət etmişdir. Azərbaycan-Ermənistan dövlət sərhədində əsgərləri ilə birlikdə bayraq qaldırmaq xoşbəxtliyi ona da nəsib olmuşdur.

B.M.Nəsibov hal-hazırda Şəki Regional "Asan Xidmət" mərkəzində direktor müavini vəzifəsində çalışır.

**Mayor**
**Rəşad Əbülfət oğlu**
**QAFAROV**



9 noyabr 1987-ci ildə Bakı şəhərində anadan olmuşdur (əslən Baş Göynükdəndir). 1994-2002-ci illərdə Binəqədi rayonundakı Mirzə Xosrov Axundzadə adına 102 saylı tam orta məktəbində, 2002-2005-ci illərdə Cəmşid Naxçıvanski adına Hərbi liseydə, 2005-2009-cu illərdə isə Heydər Əliyev adına Azərbaycan Ali Hərbi Məktəbində "Yerüstü Artilleriya" ixtisası üzrə təhsil almışdır. 2009-2010-cu illərdə Silahlı Qüvvələrin Təlim-Tədris Mərkəzinin zabit ixtisas kursunda dinləyici vəzifəsində oxumuşdur.

R.Ə.Qafarov İkinci Qarabağ müharibəsi zamanı Suqovuşan və Laçın uğrunda gedən döyüşlərdə iştirak etmişdir.

Dövlət tərəfindən xidməti həmişə yüksək qiymətləndirilmişdir. Məsələn, o, "Silahlı Qüvvələrin Yaranmasının 90, 95, 100 illiyinə görə", "Qüsursuz xidmətə görə" 3-cü, 2-ci dərəcə, "2-ci Məharət dərəcəsi" və Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə isə "Laçın və Suqovuşanın azad olunmasına görə" medallarıyla təltif edilmişdir.

Ailəlidir, iki övladı var.



**Mayor**
**Amid Rizvan oğlu İSAYEV**

6 yanvar 1989-cu ildə Gürcüstan Respublikasının Telavi şəhərində anadan olmuşdur (Əslən Baş Göynüklüdür). 1996-2007-ci illərdə Bakı şəhəri Xəzər rayonu, 216 saylı tam orta məktəbində, 2007-2011-ci illərdə isə Heydər Əliyev adına Azərbaycan Ali Təyyarəçilik məktəbində "Radioelektron avadanlıqları" ixtisası üzrə təhsil almışdır. Məktəbi leytenant rütbəsi ilə bitirmişdir. 2011-ci ildə Azərbaycan Respublikası Müdafiə Nazirinin əmrinə əsasən hərbi qulluğunu davam etdirmək üçün Uçuş-Texniki Hazırlığı Təlim Mərkəzinə göndərilmişdir. 2012-ci ildə Uçuş-Texniki Hazırlığı Təlim Mərkəzini bitirmiş və Azərbaycan Respublikası Müdafiə Nazirinin əmrinə əsasən N saylı Hərbi Hissədə xidmətə başlamışdır.

Mayor A.R.İsayev İkinci Qarabağ müharibəsi zamanı tapşırılan vəzlfələrin öhdəsindən bacarıqla gəlmişdir. O, Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Vətən uğrunda" və "Cəbrayılın azad olunmasına görə" medallarıyla təltif edilmişdir.

**İsrail Abdulla oğlu ƏSGƏROV**



31 dekabr 1987-ci ildə Şəki rayonunun Baş Göynük kəndində anadan olmuşdur. 1994-1998-ci illərdə Qax rayon Tanqıt kənd tam orta məktəbində, 1998-2005-ci illərdə Qax rayon Baydərli kənd tam orta məktəbində təhsil almışdır. 2006-2007-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur. 2020-ci ilin sentyabr ayından N saylı hərbi hissədə müddətdən artıq hərbi xidmətə başlamış, İkinci Qarabağ müharibəsində iştirak etmişdir. Talış yüksəkliyi və Ağdərə istiqamətində döyüşmüşdür.

İ.A.Əsgərov Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Cəsur döyüşçü" və "Suqovuşanın azad olunmasına görə" medallarıyla təltif edilmişdir.

Ailəlidir, bir övladı var.



**İsmayıl Musail oğlu YUSİFOV (Qazi)**

10 fevral 1988-ci ildə Şəki rayonunun Baş Göynük kəndində anadan olmuşdur. 1995-2006-cı illərdə Baş Göynük kənd 2 saylı tam orta məktəbində təhsil almışdır. 2007-ci ildən baş gizir kimi hərbi xidmətdədir.

İ.M.Yusifov 2016-cı ilin aprel ayında Lələtəpə uğrunda gedən döyüşlərdə fəal iştirak etmişdir. İkinci Qarabağ müharibəsində Suqovuşan, Ağdərə istiqamətlərində gedən döyüşlərə qatılmış, oktyabrın 14-də yaralanmışdır.

İ.M.Yusifov 2013-cü ildə “Silahlı Qüvvələrin 90, 95 illiyi”, “Qüsursuz xidmətə görə” 3-cü dərəcə , “Cəsur döyüşçü”, “Suqovuşanın azad olunmasına görə” medallarıyla təltif edilmişdir.

Ailəlidir, üç övladı var.

**Qaçay Dursunəli oğlu ABDULLAYEV (Qazi)**



24 fevral 1989-cu ildə Şəki rayonunun Baş Göynük kəndində anadan olmuşdur. 1996-2007-ci illərdə Baş Göynük kənd 2 saylı tam orta məktəbində təhsil almışdır. 2007-2009-cu illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

Q.D.Abdullayev 2010-cu ilin 26 sentyabrında Azərbaycan Respublikası Müdafiə Nazirliyi Təlim-Tədris Mərkəzinin gizir hazırlığı kursuna daxil olmuşdur. 2011-ci, mart ayının 7-də həmin kursu T-72 tank komandiri ixtisası üzrə bitirmiş və N saylı hərbi hissəyə göndərilmişdir.

Q.D.Abdullayev İkinci Qarabağ müharibəsi zamanı Talış kəndi istiqamətində gedən döyüşlərdə yaralanmış və Qazi titulunu qazanmışdır.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Laçının azad olunmasına görə", "Vətənə xidmətə görə" 3-cü dərəcə ordeni və "İgidliyə görə" medallarıyla təltif edilmişdir.

Ailəlidir, iki övladı var.



**Leytenant**
**Əfqan Sahib oğlu**
**DAVUDOV**

1 yanvar 1988-ci ildə Şəki rayonunun Baş Göynük kəndində anadan olmuşdur. 1994-2005-ci illərdə Baş Göynük kənd 1 saylı tam orta məktəbində, 2005-2009-cu illərdə Azərbaycan Dövlət Neft Akademiyasında İstehsal Proseslərinin Avtomatlaşdırılması fakültəsinin Tibbi aparatlar üzrə mühəndis texnoloq ixtisası üzrə təhsil almışdır. 2009-2010-cu illərdə həqiqi-hərbi xidmətdə olmuşdur. 2011-2012-ci illərdə “Azpetrol LTD MMC-də TXN inspektoru vəzifəsində işləmişdir. 2014-cü ilin oktyabr ayında Silahlı Qüvvələrin Təlim-Tədris Mərkəzinin gizir hazırlığı kursuna daxil olmuşdur. 2015-ci ilin yanvarında həmin kursu bitirərək N saylı hərbi hisədə döyüş maşın komandiri-operator vəzifəsində xidmətə başlamışdır. 2017-ci ilin mart ayından N saylı hərbi hissənin əməliyyat bölməsinin operatoru vəzifəsində xidmətini davam etdirmişdir.

Ə.S.Davudov 2019-cu ilin oktyabrında Silahlı Qüvvələrin Təlim-Tədris Mərkəzinin ehtiyat zabit hazırlığı kursunda təhsil almışdır. 2020-ci ilin yanvarından N saylı hərbi hissədə tağım komandiri vəzifəsində xidmət edir.

İkinci Qarabağ müharibəsinin fəal iştirakçılarından olan Ə.S.Davudov Füzuli, Qubadlı, Daşaltı, Şuşa istiqamətlərində gedən döyüşlərdə düşmənə qarşı amansızcasına döyüşmüşdür.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Koman-

dan İlham Əliyevin Sərəncamı ilə "Cəsur döyüşçü", "Vətən müharibəsi iştirakçısı", "Silahlı Qüvvələrin 100 illiyi" "Füzulinin, Şuşanın azad olunmasına görə", medallarıyla təltif edilmişdir.

Ailəlidir, iki övladı var.



**Xaliq Musa oğlu**
**MƏMMƏDOV**

3 avqust 1989-cu ildə Şəki rayonunun Baş Göynük kəndində anadan olmuşdur. 1995-2006-cı illərdə Baş Göynük kənd 2 saylı tam orta məktəbində, 2007-2011-ci illərdə isə Bakı Dövlət Universitetinin Hüquq fakültəsində təhsil almışdır. 2011-2012-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

X.M.Məmmədov 2013-cü il fevral ayının 20-dən Azərbaycan Respublikası Hərbi Prokurorluğu, Füzuli rayon Hərbi Prokurorluğunda müstəntiq vəzifəsi üzrə stajor, müstəntiq (sınaq müddəti ilə), böyük müstəntiq vəzifələrində işləmişdir. Ədliyyə kapitanı rütbəsinədək yüksəlmişdir.

5 dekabr 2018-ci il tarixdən orqanlararası qarşılıqlı razılıq əsasında Azərbaycan Respublikası Prezidenti yanında Vətəndaşlara Xidmət və Sosial İnnovasiyalar Agentliyinə keçirilmiş və Agentliyin tabeliyində olan Şəki Regional Asan Xidmət Mərkəzinin Vətəndaşların Hüquqlarının təminatı şöbəsində baş məsləhətçi vəzifəsində işləyir. İkinci dərəcəli dövlət qulluqçusudur.

X.M.Məmmədov 21 sentyabr 2020-ci ildə hərbi təlimə cəlb edilmiş və “Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı” ilə İkinci Qarabağ müharibəsinə qatılmış və Kəlbəcərin azad olunması uğrun-

da gedən döyüşlərdə üzərinə düşən vəzifələrin öhdəsindən layiqincə gəlmişdir. Eyni zamanda təhqiqat bölməsinin təhqiqatçısı kimi 5-10 noyabr arası Füzuli, Xocavənd, Qubadlı rayonlarında ezamiyyətdə olmuşdur.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Kəlbəcərin, Laçının azad olunmasına görə", "Hərbi xidmətdə fərqləndiyinə görə" medallarıyla təltif edilmişdir.



**Kapitan**
**Maşallah Zahid oğlu**
**SALAHOV**

19 dekabr 1989-cu ildə Şəki rayonunun Baş Göynük kəndində anadan olmuşdur. 1996-2007-ci illərdə Baş Göynük kənd 1 saylı tam orta məktəbində təhsil almışdır. 2007-ci ildə Heydər Əliyev adına Ali Hərbi Məktəbə daxil olmuşdur. 2011-ci ildə həmin məktəbi "Yerüstü Artilleriya" ixtisası üzrə bitirərək, leytenant rütbəsi almışdır. 2011-2013-cü illərdə Silahlı Qüvvələrin Təlim-Tədris Mərkəzində zabit təkmilləşdirmə kursunda oxumuşdur.

M.Z.Salahov 2012-ci ildən 2015-ci ilin 15 avqustuna kimi N saylı hərbi hissədə tağım komandiri vəzifəsində xidmət etmişdir. 2015-ci il, avqust ayının 15-dən N saylı hərbi hissədə minaatan batareyasının komandiri vəzifəsinə təyin olunmuşdur. 2020-ci ilin mayından N saylı hərbi hissədə Artilleriya rəisi vəzifəsində xidmət edir. İkinci Qarabağ müharibəsi zamanı Talış, Suqovuşan kəndlərinin və Murovdağ yüksəkliyinin erməni quldurlarından təmizlənməsində iştirak etmişdir. Yaralanmasına baxmayaraq, döyüş səngərinə geri qayıtmışdır.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Vətənə xidmətə görə" 3-cü dərəcə ordeni və "Suqovuşanın azad olunmasına görə" medalıyla təltif edilmişdir.

Hal-hazırda kapitan rütbəsində Vətənə xidmətini davam etdirir.

Ailəlidir, iki övladı var.

**Mais Mirzəli oğlu**
**İLYASOV**



12 mart 1982-ci ildə Şəki rayonunun Baş Göynük kəndində anadan olmuşdur. 1988-1999-cu illərdə Baş Göynük kənd 2 saylı tam orta məktəbində təhsil almışdır. 1999-2000-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

M.M.İlyasov 2002-ci ildə gizir kursunu bitirmiş və xidmətə başlamışdır. 2016-cı il aprel döyüşlərinin iştirakçısı olmuşdur. İkinci Qarabağ müharibəsində də iştirak etmiş və mühüm tapşırıqların öhdəsindən layiqincə gəlmişdir.



**Kapitan**
**Ramin Ramiz oğlu**
**ƏDİLOV**

28 dekabr 1989-cu ildə Mingəçevir şəhərində anadan olmuşdur. 1996-2007-ci illərdə Mingəçevir şəhər 8 saylı tam orta məktəbində, 2007-2011-ci illərdə isə Heydər Əliyev adına Milli Təhlükəsizlik Akademiyasının Sərhəd Qoşunları fakültəsində təhsil almışdır.

R.R.Ədilov İkinci Qarabağ müharibəsi zamanı komandanlıq tərəfindən verilmiş əmrləri şərəflə və peşəkarcasına yerinə yetirmişdir. Hal-hazırda Dövlət Sərhəd Xidmətində pilot kimi xidmətini davam etdirir.

Ailəlidir, iki övladı var.

**Qabil Ramiz oğlu**
**ƏDİLOV**



1 yanvar 1991-ci illərdə Mingəçevir şəhərində anadan olmuşdur. 1996-2007-ci illərdə Mingəçevir şəhər 8 saylı tam orta məktəbində, 2009-2013-cü illərdə isə Bakı Dövlət Universitetinin Kimya fakültəsində təhsil almışdır. 2013-2014-cü illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

Q.R.Ədilov "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixliSərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmış, Füzuli, Cəbrayıl, Suqovuşan, Talışkənd istiqamətində gedən döyüşlərdə iştirak etmişdir. Hazırda "Sarvan" QSC-də çalışır.

**Yeri gəlmişkən:**

Bu günlərdə "Fesbuuk" sosial şəbəkəsində bir paylaşıma rast gəldik. 2020-ci ilin 5 dekabrında edilmiş bu paylaşımı oxuyarkən, inanın yer kürəsi başımıza fırlandı. Eyni zamanda təəccübqarışıq fərəh hissi kövrəlməyimə səbəb oldu. Tanrıya şükür etdik və ürəyimizdə dedik: bax Azərbaycan xanımı budur. Övladının keşiyini çəkmək üçün evindən qalxıb cəbhə xəttinə kimi ancaq bizim analarımız gedə bilər.

Bu yerdə istədik həmin paylaşımı kitabımıza daxil edək. Ona görə ki, gələcək nəsillərimiz bu hadisədən xəbərdar

olsunlar. Bizim buna çox ehtiyacımız var. Axı bütün həndəvərimiz düşmənlə doludur.

## Tarixin və ilin ailəsini tanıyın

Ədilovlar ailəsinin başçısı, həyatını, üç övladını və ömürgün yoldaşını Vətən müharibəsində fəda edən Ramiz dayı.

Heç vaxt kövrək və sarı simli yazı yazmamışam, lakin Ədilovlar ailəsi haqqında danışmasam özümü dövlətimə xəyanət etmiş kimi hiss edərəm.

Ramiz dayının üç oğlan övladı var. Özü Mingəçevirdə İES-də çalışır. Bir oğlu Ramin bəy pilotdur, digər oğlu Rəşid DSX-nın XTD-də xidmət edir, üçüncü oğlu Qabil Ədilov döyüş yoldaşım oldu. Ramiz dayı üç oğlunun Vətən müharibəsində iştirakı ilə fəxr edir. Adam rəsmən Milli Ordumuza bir manqa təhvil verib; elə manqa ki, dövləti üçün fikirləşnmədən canlarını verərlər. Necə ki, verdilər.

Mən dünən tərxis olunanda bir məsələni öyrəndim. Demə Ramiz dayının həyat yoldaşı könüllü olaraq bizim hərbi hissəyə gələrək əsgərlərə yemək bişirirmiş. Lakin kimsənin bundan xəbər yox imiş. Aylardır qardaşımın anasının əllərindən körək yemişəm, bu məsələni bilməmişəm. Bu məsələni iki aydan sonra biləndə çox kövrəldim və qəribə hala düşdüm.

Qabil gecələr gizlincə anasını görmək üçün yeməkxananın arxasına gedirmiş, kimsə bunu görmürmüş. Bu övladı üçün həyatından keçməyi qəbul etmiş bir ananın ümumiləşmiş obrazı hesab olunmalıdır.

Qarşınızda baş əyirəm Ramiz dayı!..

***Fuad Muradov***

**Leytenanat**
**Rəşid Ramiz oğlu**
**ƏDİLOV**



12 oktyabr 1998-ci ildə Mingəçevir şəhərində anadan olmuşdur. 2004-2015-ci illərdə Mingəçevir şəhər 8 saylı tam orta məktəbində, 2015-2019-cu illərdə isə Mingəçevir Dövlət Universitetinin Maşın mühəndisi fakültəsində təhsil almışdır. 2019-2020-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur. 2020-ci ilin avqust ayından Dövlət Sərhəd Xidmətində zabit kimi xidmətə başlamışdır.

R.R.Ədilov İkinci Qarabağ müharibəsi zamanı Cəbrayıl, Zəngilan, Qubadlı istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Cəbrayıl və Zəngilanın azad olunmasına görə" medallarıyla təltif edilmişdir.

Hal-hazırda Zəngilanda xidmətini davam etdirir.



**Abbas Qinyaz oğlu**
**CƏFƏROV**

5 fevral 1988-ci ildə Şəki rayonunun Baş Göynük kəndində anadan olmuşdur. 1994-2005-ci illərdə Baş Göynük kənd 1 saylı tam orta məktəbində təhsil almışdır. 2006-2007-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

A.Q.Cəfərov 2016-cı ildən çavuş kimi xidmət edir. İkinci Qarabağ müharibəsi zamanı Füzuli, Zəngilan, Qubadlı, Cəbrayıl istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Hərbi xidmətdə fərqlənməyə görə" 3-cü dərəcə medalıyla təltif edilmişdir.

**Xəyal Soltan oğlu SALMANOV**



28 dekabr 1989-cu ildə Şəki rayonunun Baş Şabalıd kəndində anadan olmuşdur.1996-2007-ci illərdə Baş Şabalıd kənd tam orta məktəbində təhsil almışdır. 2008-2009-cu illərdə həqiqi-hərbi xidmətdə olmuşdur. 2014-cü ildən Dövlət Sərhəd Xidmətində gizir kimi xidmət edir.

X.S.Salmanov İkinci Qarabağ müharibəsi zamanı Zəngilan, Qubadlı, Cəbrayıl rayonları istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Ailəlidir, iki övladı var.



**Baş leytenant**
**Qadir İsgəndər oğlu**
**HƏSƏNOV**

17 iyun 1990-cı ildə Şəki rayonunun Baş Şabalıd kəndində anadan olmuşdur. 1996-2007-ci illərdə Baş Şabalıd kənd orta məktəbində, 2007-2011-ci illərdə Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU) Şəki filialının riyaziyyat fakültəsində təhsil almışdır.

Q.İ.Həsənov 2011-ci ildə Müdafiə Nazirliyinin N saylı hərbi hissəsində tağım komandiri kimi xidmətə başlamışdır. 2015-ci ildən Dövlət Sərhəd Xidmətində (DSX) Çevik Hərəkat Taborunda tağım komandiri kimi xidmət edir.

İkinci Qarabağ müharibəsində iştirak etmiş Q.İ.Həsənov Cəbrayıl, Qubadlı və Zəngilan istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Cəbrayılın, Qubadlının azad olunmasına görə", "Vətən müharibəsi iştirakçısı", "Silahlı Qüvvələrin veteranı", "Vətənə xidmətə görə" medallarıyla təltif edilmişdir.

Hal-hazırda vətən qarşısında olan xidmətini davam etdirir.

Ailəlidir, iki övladı var.

**Kapitan**
**İsfəndiyar İlham oğlu**
**ALCANOV**



5 iyul 1990-cı ildə Şəki rayonunun Baş Göynük kəndində anadan olmuşdur. 1996-2007-ci illərdə Baş Göynük kənd 2 saylı tam orta məktəbində, 2007-2011-ci illərdə Heydər Əliyev adına Ali Hərbi Məktəbdə təhsil almışdır. 2011-2012-ci illərdə Silahlı Qüvvələrin Təlim-Tədris Mərkəzində zabit ixtisası kursunda oxumuşdur. 2012-2014-cü illərdə N saylı hərbi hissədə Artilleriya tağım komandiri, 2014-2015-ci illərdə N saylı hərbi hissədə topogeodeziya tağım komandiri, 2015-2016-cı illərdə N saylı hərbi hissədə Artilleriya tağım komandiri vəzifələrində xidmət etmişdir. 2016-cı ildən N saylı hərbi hissədə batareya komandiri vəzifəsində, kapitan rütbəsində xidmətini davam etdirir.

İ.İ.Alcanov İkinci Qarabağ müharibəsində Füzuli, Şuşa döyüşlərində iştirak etmişdir. Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə “Füzulinin, Şuşanın azad olunmasına görə” medallarıyla təltif edilmişdir.

İ.İ.Alcanov xidməti dövründə “Silahlı Qüvvələrin yaranmasının 95, 100 illiyinə görə”, “Qüsursuz xidmətə görə” 3-cü dərəcə, “Döyüşdə fərqləndiyinə görə”, “Hərbi xidmətdə fərqləndiyinə görə” medallarıyla təltif edilmişdir.

Ailəlidir, bir övladı var.

## İbrahim Zakir oğlu BƏKİROV (Qazi)

6 fevral 1993-cü ildə Şəki rayonunun Qumux kəndində anadan olmuşdur. 2000-2011-ci illərdə Qumux kənd tam orta məktəbində təhsil almışdır. 2011-2012-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

Müddətdən artıq hərbi xidmət edən İ.Z.Bəkirov İkinci Qarabağ müharibəsində Füzuli, Qubadlı və Şuşa istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Cəsur döyüşçü", "Vətən müharibəsi iştirakçısı", "Füzuli, Qubadlı və Şuşanın azad olunmasına görə" medallarıyla təltif edilmişdir.

Hal-hazırda hərbi xidmətini davam etdirir.

**Elnur Rasim oğlu**
**SƏLİMOV (Qazi)**



27 sentyabr 1993-cü ildə Şəki rayonunun Baş Layısqı kəndində anadan olmuşdur. 1999-2008-ci illərdə Baş Layısqı kənd tam orta məktəbində, 2008-2011-ci illərdə Cəmşid Naxçıvanski adına Hərbi liseydə, 2015-2016-cı illərdə isə Heydər Əliyev adına Ali Hərbi Məktəbdə təhsil almışdır. 2015-2016-cı illərdə Təlim-Tədris Mərkəzində zabit kursunu bitirmişdir.

E.R.Səlimov İkinci Qarabağ müharibəsində Ağdam istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Cəsur döyüşçü" və "Ağdamın azad olunmasına görə" medallarıyla təltif edilmişdir.

Oktyabrın 27-də Ağdamda ağır yaralanmışdır.

## Amil Cəmil oğlu MƏMMƏDOV (Qazi)

22 mart 1994-cü ildə Şəki rayonunun Qumux kəndində anadan olmuşdur. 2001-2012-ci illərdə Qumux kənd tam orta məktəbində təhsil almışdır. 2012-2013-cü illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

A.C.Məmmədov "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmış, Füzuli, Hadrut, Xocavənd, Laçın istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Oktyabrın 25-də Xocavənd rayonunun Tuğ kəndində yaralanmışdır.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Xocavənd və Laçının azad olunmasına görə" medallarıyla təltif edilmişdir.

**Məmməd Əli oğlu**
**BABAYEV**



9 sentyabr 1994-cü ildə Şəki rayonunun Qumux kəndində anadan olmuşdur. 2001-2009-cu illərdə Qumux kənd tam orta məktəbində, 2010-2011-ci illərdə isə Rəşid bəy Əfəndiyev adına Şəki şəhər10 saylı tam orta məktəbində təhsil almışdır. 2012-2014-cü illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

M.Ə.Babayev "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmış, Xocavənd rayonunun və kəndlərinin işğaldan azad olunmasında iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Xocavəndin azad olunmasına görə" medalıyla təltif edilmişdir. Hazırda hərbi xidmətini davam etdirir.



**Namiq Natiq oğlu SAATOV**

2 dekabr 1995-ci ildə Şəkin rayonunun Cunud kəndində anadan olmuşdur. 2002-2013-cü illərdə Cunud kənd tam orta məktəbində təhsil almışdır. 2015-2016-cı illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

N.N.Saatov “Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı” ilə İkinci Qarabağ müharibəsinə qatılmış, Ağdərə-Kəlbəcər istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə “Kəlbəcərin azad olunmasına görə” və “Cəsur döyüşçü” medallarıyla təltif edilmişdir.

**Asif Əhməd oğlu MƏMMƏDOV**



19 dekabr 1995-ci ildə Şəki rayonunun Şin kəndində anadan olmuşdur. 2003-2014-cü illərdə Şin kənd tam orta məktəbində təhsil almışdır. 2014-2016-cı illərdə həqiqi-hərbi xidmətdə olmuşdur. 2019-cu ildə Dövlət Sərhəd Qoşunlarının Xüsusi Təyinatlı Qüvvələrində gizir kimi xidmətə başlamışdır.

A.Ə.Məmmədov İkinci Qarabağ müharibəsinin ilk günündən Murov silsiləsində gedən döyüşlərin iştirakçısı olmuşdur. Sonra isə o, Füzuli-Cəbrayıl və Zəngilan istiqamətində gedən döyüşlərdə iştirak etmişdir. Hal-hazırda Zəngilan rayonu ərazisində xidmətini davam etdirir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Cəbrayılın azad olunmasına görə" medaliyla təltif edilmişdir.

## Məmməd Növzət oğlu BABAYEV

14 iyul 1996-cı ildə Şəki rayonunun Baş Layısqı kəndində anadan olmuşdur. 2002-2013-cü illərdə Baş Layısqı kənd tam orta məktəbində təhsil almışdır. 2014-2016-cı illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

M.N.Babayev "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmış və Suqovuşan-Ağdərə istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

**İzzət Teymur oğlu ZEYDOV (Qazi)**



15 mart 1996-cı ildə Şəki rayonunun Şin kəndində anadan olmuşdur. 2001-2013-cü illərdə Şin kənd tam orta məktəbində təhsil almışdır. 2014-2015-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

İ.T.Zeydov "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmış, Cəbrayıl və Qubadlı istiqamətində gedən döyüşlərdə iştirak etmişdir. Oktyabrın 17-də Qubadlıda yaralanmış və Hospitalda müalicə olunduqdan sonra yenidən cəbhəyə geri dönmüşdür. Bir müddət Laçının müdafiəsində də dayanmışdır.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Cəbrayılın, Qubadlının azad olunmasına görə" və "Hərbi xidmətə görə" medallarıyla təltif edilmişdir.

Atası Teymur İsfəndiyar oğlu Zeydov Birinci Qarabağ müharibəsinin qazisidir.



**Kamal Səyavuş oğlu SALAHOV**

16 yanvar 1997-ci ildə Şəki rayonunun Baş Layısıqı kəndində anadan olmuşdur. 2003-2014-cü illərdə Baş Layısqı kənd tam orta məktəbində, 2014-2018-ci illərdə isə Bakı Mühəndislik Universitetində təhsil almışdır.

K.S.Salahov 2019-2021-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur. Xidməti dövrü İkinci Qarabağ müharibəsinə təsadüf etdiyindən o, Cəbrayıl və Qubadlı torpaqlarının erməni işğalından azad olunması uğrunda döyüşmüşdür.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Cəbrayıl və Qubadlının azad olunmasına görə" medallarıyla təltif edilmişdir.

**Samir Mahir oğlu İSMAYILOV**

22 yanvar 1997-ci ildə Şəki rayonunun Baş Layısqı kəndində anadan olmuşdur. 2003-2014-cü illərdə Baş Layısqı kənd tam orta məktəbində təhsil almışdır. 2015-2016-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

S.M.İsmayılov "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmış, Murovdağ-Kəlbəcər istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Kəlbəcərin azad olunmasına görə", "Vətən müharibəsi iştirakçısı" medallarıyla təltif edilmişdir.



**Oruc Quzu oğlu**
**NƏCƏFOV (Qazi)**

1 fevral 1997-ci ildə Şəki rayonunun Şin kəndində anadan olmuşdur. 2004-2015-ci illərdə Şin kənd tam orta məktəbində təhsil almışdır. 2015-2016-cı illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

O.Q.Nəcəfov "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmış, Şuşa-Xankəndi istiqamətində gedən döyüşlərdə iştirak etmişdir. Noyabrın 7-də Xankəndində ağır yaralanmışdır.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə" Döyüşdə fərqləndiyinə görə" və "Şuşanın azad olunmasına görə" medallarıyla təltif edilmişdir.

## Məhəmməd Əlövsət oğlu ABAKƏROV

5 oktyabr 1997-ci ildə Şəki rayonunun Baş Layısqı kəndində anadan olmuşdur. 2004-2015-ci illərdə Baş Layısqı kənd tam orta məktəbində təhsil almışdır. 2015-2017-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

M.Ə.Abakərov "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmış, Suqovuşan, Qubadlı, Zəngilan istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Suqovuşanın azad olunmasına görə" medalıyla təltif edilmişdir.



**Qasım Mübariz oğlu QASIMOV**

4 mart 1997-ci ildə Şəki rayonunun Baş Layısqı kəndində anadan olmuşdur. 2003-2014-cü illərdə Baş Layısqı kənd tam orta məktəbində təhsil almışdır. 2015-2016-cı illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

Q.M.Qasımov "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmış, Şuşa-Laçın istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasnın Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Şuşanın azad olunmasına görə" medalıyla təltif edilmişdir.

**Elvin Novruz oğlu ƏHMƏDXANOV**



2 noyabr 1997-ci ildə Şəki rayonunun Qumux kəndində anadan olmuşdur. 2004-2015-ci illərdə Qumux kənd tam orta məktəbində təhsil almışdır. 2016-2018-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

E.N.Əhmədxanov "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmış və Füzuli, Şuşa, Xocavənd istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Şuşanın azad olunmasına görə" medalıyla təltif edilmişdir.



**Məmməd Kamran oğlu MƏMMƏDLİ**

23 noyabr 1997-ci ildə Şəki rayonunun Baş Layısqı kəndində anadan olmuşdur. 2004-2015-ci illərdə Baş Layısqı kənd tam orta məktəbində təhsil almışdır. 2016-2017-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

M.K.Məmmədli "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmış, Suqovuşan, Ağdərə, Ağdam istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Suqovuşanın azad olunmasına görə" medalıyla təltif edilmişdir.

**Elnur Rəhim oğlu**
**SÜLEYMANOV**



27 noyabr 1997-ci ildə Şəki rayonunun Baş Layısqı kəndində anadan olmuşdur. 2004-2015-ci illərdə Baş Layısqı kənd tam orta məktəbində təhsil almışdır. 2016-2017-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

E.R.Süleymanov "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmış, Murovdağ-Kəlbəcər istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Kəlbəcərin azad olunmasına görə" medalıyla təltif edilmişdir.



**Cəlal Osman oğlu ƏLİMİRZƏYEV**

1997-ci ildə Şəki rayonunun Şin kəndində anadan olmuşdur. 2003-2014-cü illərdə Şin kənd tam orta məktəbində təhsil almışdır. 2015-2017-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

C.O.Əlimirzəyev "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmış, Suqovuşan, Talışkənd istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

**Asiman Xanlar oğlu MAQSUDOV (Qazi)**



21 iyul 1998-ci ildə Şəki rayonunun Baş Layısqı kəndində anadan olmuşdur. 2004-2016-cı illərdə Baş Layısqı kənd tam orta məktəbində təhsil almışdır. 2016-2018-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

A.X.Maqsudov "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmış və Suqovuşan qəsəbəsinin erməni işğalçılarından təmizlənməsi əməliyyatında iştirak etmişdir. Oktyabrın 16-da Suqovuşanda ağır yaralanmışdır.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Cəsur döyüşçü" və "Suqovuşanın azad olunmasına görə" medallarıyla təltif edilmişdir.



**Əhməd Telman oğlu SALAHOV**

24 dekabr 1998-ci ildə Şəki rayonunun Şin kəndində anadan olmuşdur. 2004-2016-cı illərdə Şin kənd tam orta məktəbində təhsil almışdır. 2017-2018-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

Ə.T.Salahov "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmış, Murovdağ-Füzuli və Xocavənd istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Füzuli və Xocavəndin azad olunmasına görə" medallarıyla təltif edilmişdir.

**Famil Habil oğlu MƏMMƏDOV**



25 fevral 1999-cu ildə Şəki rayonunun Şin kəndində anadan olmuşdur. 2006-2017-ci illərdə Şəki şəhər 3 saylı tam orta məktəbində təhsil almışdır. 2017-2018-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

F.H.Məmmədov "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmış, Füzuli, Xocavənd və Şuşa uğrunda gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Şuşanın azad olunmasına görə" medalıyla təltif edilmişdir.



**Umudvar Taleh oğlu QABULOV**

18 iyul 1999-cu ildə Şəki rayonunun Cunud kəndində anadan olmuşdur. 2005-2010-cu illərdə Cunud kənd tam orta məktəbində, 2010-2016-cı illərdə isə Bakı şəhəri, Xətai rayonu 260 saylı tam orta məktəbində təhsil almışdır. 2007-2019-cu illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

U.T.Qabulov “Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı” ilə İkinci Qarabağ müharibəsinə qatılmış, Zəngilan-Qubadlı istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

## Simon Bəxtiyar oğlu İBRAHİMOV

21 iyun 1999-cu ildə Şəki rayonunun Baş Layısqı kəndində anadan olmuşdur. 2005-2016-cı illərdə Baş Layısqı kənd tam orta məktəbində təhsil almışdır. 2017-2019-cu illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

S.B.İbrahimov "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmış, Suqovuşan, Ağdam və Laçın istiqmətində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Suqovuşan və Laçının azad olunmasına görə" medallarıyla təltif edilmişdir.



**Sadiq Şaiq oğlu**
**ŞAMİLLİ**

29 oktyabr 1999-cu ildə Şəki rayonunun Baş Layısqı kəndində anadan olmuşdur. 2006-2017-ci illərdə Baş Layısqı kənd tam orta məktəbində təhsil almışdır. 2017-2019-cu illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

S.Ş.Şamilli "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmış, Füzuli, Cəbrayıl, Qubadlı və Xocavənd istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Füzulinin azad olunmasına görə" medalıyla təltif edilmişdir.

**Sərxan Sahib oğlu**
**ƏHMƏDOV**



11 aprel 2000-ci ildə Şəki rayonunun Baş Layısqı kəndində anadan olmuşdur. 2006-2017-ci illərdə Baş Layısqı kənd tam orta məktəbində təhsil almışdır. 2018-2019-cu illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

S.S.Əhmədov "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmış, təlimlərdə iştirak etmişdir.



**Elçin Qaçay oğlu**
**MÜTƏLLİBOV**

4 may 2000-ci ildə Şəki rayonunun Qumux kəndində anadan olmuşdur. 2007-2008-ci illərdə Qumux kənd tam orta məktəbində təhsil almışdır. 2018-2020-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

E.Q.Mütəllibov İkinci Qarabağ müharibəsi zamanı Suqovuşan, Ağdam və Ağdərə istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Suqovuşanın azad olunmasına görə" medalıyla təltif edilmişdir.

**İxtiyar Ruzigar oğlu QABULOV**



30 may 2000-ci ildə Şəki rayonunun Cunud kəndində anadan olmuşdur. 2006-2017-ci illərdə Cunud kənd tam orta məktəbində təhsil almışdır. 2018-2020-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

İ.R.Qabulov "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmış, Xocavənd, Şuşa, Laçın istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikası Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Şuşanın azad olunmasına görə" medalıyla təltif edilmişdir.

**Mövlan Hikmət oğlu HÜSEYNOV**

5 dekabr 2000-ci ildə Şəki rayonunun Baş Layısqı kəndində anadan olmuşdur.

2006-2017-ci illərdə Baş Layısqı kənd tam orta məktəbində təhsil almışdır.

2019-2021-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

M.H.Hüseynov İkinci Qarabağ müharibəsi zamanı Cəbrayıl, Qubadlı və Laçın istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Cəbrayıl, Qubadlı və Laçının azad olunmasına görə" medallarıyla təltif edilmişdir.

## Cəsur Bəhram oğlu SEYDALIYEV

4 yanvar 2001-ci ildə Şəki rayonunun Baş Layısqı kəndində anadan olmuşdur. 2007-2018-ci illərdə Baş Layısqı kənd tam orta məktəbində təhsil almışdır. 2019-2020-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

C.B.Seydalıyev "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmış, Murovdağ, Kəlbəcər və Ağdərə istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Kəlbəcərin azad olunmasına görə" medalıyla təltif edilmişdir.



**Hacı Rasim oğlu HACIZADƏ**

2 fevral 2001-ci ildə Şəki rayonunun Baş Layısqı kəndində anadan olmuşdur. 2007-2018-ci illərdə Baş Layısqı kənd tam orta məktəbində təhsil almışdır. 2019-2021-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

H.R.Hacızadə İkinci Qarabağ müharibəsi zamanı Ağdam, Füzuli, Cəbrayıl, Kəlbəcər, Laçın, Suqovuşan və Qubadlı istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Müharibə iştirakçısı", "Cəsur döyüşçü" və "Ağdamın işğaldan azad olunmasına görə" medallarıyla təltif edilmişdir.

**Nurlan Vüqar oğlu**
**ƏHMƏDOV**



1 mart 2001-ci ildə Şəki rayonunun Baş Layısqı kəndində anadan olmuşdur. 2007-2018-ci illərdə Baş Layısqı kənd tam orta məktəbində təhsil almışdır. 2019-2021-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

N.V.Əhmədov İkinci Qarabağ müharibəsi zamanı Füzuli, Cəbrayıl, Xocavənd, Hadrut və Şuşakənd istiqamətində gedən döyüşlərdə iştirak etmişdir. Oktyabrın 12-də Hadrutda yaralanmışdır.



**Məmməd Vüqar oğlu**
**BƏŞİROV**

15 aprel 2001-ci ildə Şəki rayonunun Cunud kəndində anadan olmuşdur. 2006-2017-ci illərdə Bakı şəhərindəki 213 saylı tam orta məktəbində təhsil almışdır. 2019-cu ilin aprel ayında həqiqi-hərbi xidmətə yollanmış, 2021-ci ilin 3 aprelində ehtiyata buraxılmışdır.

M.V.Bəşirov İkinci Qarabağ müharibəsi zamanı Füzuli, Cəbrayıl, Xocavənd və Şuşa istiqamətində gedən döyüşlərdə top komandiri kimi döyüşmüşdür. Xidmət etdiyi hərbi hissədə adı şərəf kitabına yazılmışdır.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "İgidliyə görə" və "Füzulinin, Xocavəndin azad olunmasına görə" medallarıyla təltif edilmişdir.

**Nurlan Nazim oğlu SÜLEYMANOV (Qazi)**




28 iyun 2001-ci ildə Şəki rayonunun Baş Layısqı kəndində anadan olmuşdur. 2007-2018-ci illərdə Baş Layısqı kənd tam orta məktəbində təhsil almışdır. 2019-2021-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

N.N.Süleymanov İkinci Qarabağ müharibəsi zamanı Füzuli, Cəbrayıl, Xocavənd, Hadrut, Şuşa və Kəlbəcər istiqamətində gedən döyüşlərdə iştirak etmişdir. Dəfələrlə ağır yaralanmağına baxmayaraq döyüş bölgəsini tərk etməmiş, düşmənə qarşı amansızcasına döyüşmüşdür.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "İgidliyə görə", "Şücaətə görə", "Vətən müharibəsi iştirakçısı" və "Füzuli, Cəbrayıl, Kəlbəcər və Şuşanın azad olunmasına görə" medallarıyla təltif edilmişdir.



**Asim Akif oğlu QARAYEV**

6 avqust 2001-ci ildə Şəki rayonunun Şin kəndində anadan olmuşdur. 2008-2018-ci illərdə Şin kənd tam orta məktəbində təhsil almışdır. 2019-2021-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur. Xidməti İkinci Qarabağ müharibəsinə təsadüf etdiyindən o, işğal olunmuş torpaqlarımızın azad olunması uğrunda döyüşmüşdür. Suqovuşan-Ağdərə və Ağdam istiqamətində əldə olunan uğurlarda Asim Qarayevin də payı vardır.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Suqovuşan və Ağdamın azad olunmasına görə" medallarıyla təltif edilmişdir.

**Samir Habil oğlu**
**İSMAYILOV**



8 oktyabr 2001-ci ildə Şəki rayonunun Şin kəndində anadan olmuşdur. 2008-2019-cu illərdə Şin kənd tam orta məktəbində təhsil almışdır. 2019-2021-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur. İkinci Qarabağ müharibəsi zamanı Füzuli və Xocavənd rayonları istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

S.H.İsmayılov Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Füzuli və Xocavəndin azad olunmasına görə" medallarıyla təltif edilmişdir.

## Məhərrəm Orxan oğlu MƏHƏRRƏMOV

27 oktyabr 2001-ci ildə Şəki rayonunun Qumux kəndində anadan olmuşdur. 2007-2018-ci illərdə Qumux kənd tam orta məktəbində təhsil almışdır. 2019-2021-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

M.O.Məhərrəmov İkinci Qarabağ müharibəsi zamanı Füzuli, Cəbrayıl, Qubadlı və Murov dağı istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Cəbrayıl, Qubadlı və Laçının azad olunmasına görə" medallarıyla təltif edilmişdir.

**Yusif Fərrux oğlu**
**HƏSƏNOV**



26 noyabr 2001-ci ildə Şəki rayonunun Şin kəndində anadan olmuşdur. 2007-2018-ci illərdə Şin kənd tam orta məktəbində təhsil almışdır. 2018-2020-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

Y.F.Həsənov "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmış, Cəbrayıl, Qubadlı və Laçın istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Cəbrayıl, Qubadlı və Laçının azad olunmasına görə" medallarıyla təltif edilmişdir.



**Şərif Ramiz oğlu ŞƏRİFOV**

14 dekabr 2001-ci ildə Şəki rayonunun Baş Layısqı kəndində anadan olmuşdur. 2007-2018-ci illərdə Baş Layısqı kənd tam orta məktəbində təhsil almışdır. 2020-2021-ci illərdə Həqiqi-hərbi xidmətdə olmuş və İkinci Qarabağ müharibəsində iştirak edərək Füzuli, Cəbrayıl, Laçın, Qubadlı və Zəngilan rayonlarının erməni işğalından azad olunması uğrunda döyüşmüşdür.

Ş.R.Şərifov Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Füzuli, Cəbrayıl, Laçın, Qubadlı və Zəngilanın azad olunmasına görə" medallarıyla təltif edilmişdir.

**Seymur Qürbət oğlu QASIMZADƏ**



2001-ci ildə Şəki rayonunun Şin kəndində anadan olmuşdur. 2008-2019-cu illərdə Şin kənd tam orta məktəbində təhsil almışdır. 2020-2021-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur. İkinci Qarabağ müharibəsi zamanı Füzuli-Xocavənd istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Füzuli və Xocavəndin azad olunmasına görə" medallarıyla təltif edilmişdir.

**Kapitan Ruhin Mikayıl oğlu MİKAYILOV (Qazi)**



19 may 1992-ci ildə Şəki rayonunun Cumakənd kəndində anadan olmuşdur. 1998-2009-cu illərdə Cumakənd tam orta məktəbində, 2009-2013-cü illərdə isə Azərbaycan Dövlət Texnologiya Universitetinin İqtisadiyyat və İdarəetmə fakültəsində təhsil almışdır. 2013-2014-cü illərdə həqiqi-hərbi xidmətdə olmuşdur. 2014-cü ildə Azərbaycan Respublikası Müdafiə Nazirliyinin Təlim-Tədris Mərkəzində zabit hazırlığı kursu keçərək leytenant rütbəsində xidmətə başlamışdır.

İkinci Qarabağ müharibəsi zamanı Suqovuşan kəndi, Murovdağ yüksəkliyi uğrunda gedən döyüşlərdə fəal şəkildə iştirak etmişdir. Sentyabrın 28-də Murovdağ yüksəkliyində yaralanmış və hospitala yerləşdirilmişdir. Yarası tam sağalmamış cəbhə xəttinə geri qayıtmış və döyüşməyə davam etmişdir. Ancaq oktyabrın 3-də Suqovuşanda yenidən düşmən gülləsi onun qisas almaq üçün alışıb-yanan ürəyindəki istəyini yarımçıq qoydu və o, növbəti dəfə ağır yaralandı…

R.M.Mikayılov Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə “Azərbaycan Bayrağı” Ordeni, “Hərbi Xidmətlərə Görə” və “Suqovuşanın azad olunmasına görə” medallarıyla təltif edilmişdir. Xidməti dövründə “Silahlı Qüvvələrin Yaradılmasının 100 illiyi” medalı ilə də mükafatlandırılmışdır.

Ailəlidir, iki övladı var.

## Qaçay Niyazi oğlu MƏMMƏDOV

29 iyun 1988-ci ildə Şəki rayonunun Cumakənd kəndində anadan olmuşdur. 1994-2005-ci illərdə Cumakənd tam orta məktəbində təhsil almışdır. 2006-2008-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur. 2011-2013-cü illərdə Zaqatala Kənd Təsərrüfatı Texnikumunda oxumuşdur.

Q.N.Məmmədov "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmaq məqsədilə təlimlərdə iştirak etmişdir. Vətən müharibəsi başa çatdıqdan sonra da hərbi xidmətini davam etdirmişdir. O, hələ 2008-ci ildə həqiqi-hərbi xidmətdə olduğu zaman bu gün Azərbaycan xalqının sevimlisi olan, mərhum generalımız, Milli Qəhrəman Polad Həşimovun imzası ilə təşəkkürnamə almışdır.

Məlumat üçün bildirək ki, 2008-ci ildə mayor Polad Həşimov N saylı Hərbi Hissənin komandiri idi.

## Kənan Nüsrət oğlu XƏLFƏTOV

10 dekabr 1990-cı ildə Şəki rayonunun Cumakənd kəndində anadan olmuşdur. 1997-2008-ci illərdə Cumakənd tam orta məktəbində təhsil almışdır. 2009-2010-cu illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

K.N.Xəlfətov "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmış, Mingəçevir və Goranboyda keçirilmiş təlimlərdə iştirak etmişdir.

## Ülvi İlham oğlu BABAYEV (Qazi)

2 aprel 1991-ci ildə Şəki rayonunun Cumakənd kəndində anadan olmuşdur. 1997-2008-ci illərdə Cumakənd tam orta məktəbində təhsil almışdır. 2009-cu ildə həqiqi-hərbi xidmətə çağırılmışdır. Xidməti dövründə gizir kimi xidmət etmişdir. İkinci Qarabağ müharibəsi zamanı Füzuli, Xocavənd, Hadrut, Cəbrayıl, Şuşa və Laçın istiqamətində gedən döyüşlərdə iştirak etmiş və sentyabrın 29-da Füzulinin Qaraxanbəyli kəndində yaralanmışdır. Yarası tam sağalmamış cəbhə xəttinə yollanan Ülvi Babayev oktyabrın 19-da növbəti dəfə ağır yaralanmışdır. Bu dəfə də şəxsi sağlamlığını təhlükə altında qoyan gizir Ülvi Babayev az müddətdən sonra yenidən döyüşçü yoldaşlarının yanına qayıtmışdır. Noyabrın 7-nə kimi düşmənə qarşı amansızcasına döyüşən Ülvi Babayev bu dəfə qədim Şuşa şəhərində düşmən gülləsinə tuş gəlmiş və o, qazi kimi hərbi xidmətdən tərxis olunmuşdur.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə “ Vətən Uğrunda”, “Cəsur Döyüşçü”,” Cəbrayıl, Xocavənd, Şuşa və Füzulinin işğaldan azad olunmasına görə” medallarıyla təltif edilmişdir.

**Emin Əhməd oğlu MƏMMƏDOV (Qazi)**

1 yanvar 1992-ci ildə Şəki rayonunun Cumakənd kəndində anadan olmuşdur. 1998-1992-ci illərdə Cumakənd tam orta məktəbində təhsil almışdır. 2009-2011-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

Ə.E.Məmmədov "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmış, Suqovuşan-Ağdərə istiqamətində gedən döyüşlərdə iştirak etmişdir. Noyabrın 4-də yaralanmışdır.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Cəsur döyüşçü" və "Suqovuşanın azad olunmasına görə" medalları ilə təltif edilmişdir.



**Elvin Fazil oğlu**
**HÜSEYNƏLİYEV**

3 avqust 1999-cu ildə Şəki rayonunun Cumakənd kəndində anadan olmuşdur. 2005-2013-cü illərdə Cumakənd tam orta məktəbində, 2013-2016-cı illərdə Cəmşid Naxçıvanski adına Hərbi Liseydə, 2016-2020-ci illərdə isə Heydər Əliyev adına Ali Hərbi Məktəbdə təhsil almışdır. Buranı leytenant rütbəsində bitirərək N saylı hərbi hissədə xidmətə başlamışdır.

E.F.Hüseynəliyevin İkinci Qarabağ müharibəsində iştirakı Murov dağının erməni işğalçılarından azad edilməsi ilə başlamışdır. Daha sonra o, cənub cəbhəsinə göndərilmiş, Cəbrayıl, Xocavənd, Hadrut, Füzuli və Şuşa uğrunda gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Cəbrayıl, Füzuli və Şuşanın azad olunmasına görə" və "Vətən uğrunda" medallarıyla təltif edilmişdir.

## Hilal Fərman oğlu HƏSƏNOV

19 dekabr 1993-cü ildə Şəki rayonunun Cumakənd kəndində anadan olmuşdur. 2000-2011-ci illərdə Cumakənd tam orta məktəbində təhsil almışdır. 2012-2013-cü illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

H.F.Həsənov "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci iltarixli Sərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmış, Suqovuşan və Murov dağı istiqamətində gedən döyüşlərdə iştirak etmişdir. Növbəti döyüşlərin birində ağır yaralanmış və 41 gün hospitalda müalicə olunmuşdur.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Cəsur döyüşçü" və "Suqovuşanın azad olunmasına görə" medalları ilə təltif edilmişdir.

## Kamil Sabir oğlu MƏMMƏDOV

3 mart 1995-ci ildə Şəki rayonunun Cumakənd kəndində anadan olmuşdur. 2001-2012-ci illərdə Cumakənd tam orta məktəbində təhsil almışdır. 2013-2014-cü illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

K.S.Məmmədov "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmış, Cəbrayıl və Zəngilan istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "İgidliyə görə" və "Cəbrayılın, Zəngilanın azad olunmasına görə" medallarıyla təltif edilmişdir.

**Leytenant**
**Seymur Fikrət oğlu ABDULLAYEV**

16 sentyabr 1996-cı ildə Şəki rayonunun Cumakənd kəndində anadan olmuşdur. 2003-2012-ci illərdə Cumakənd tam orta məktəbində, 2012-2015-ci illərdə Cəmşid Naxçıvanski adına Hərbi Liseydə, 2015-2019-cu illərdə isə Heydər Əliyev adına Ali Hərbi Məktəbdə təhsil almışdır. 2019-cu ilin 24 iyunundan 2020-ci ilin 26 oktyabrına kimi N saylı Hərbi hissədə tağım komandiri əzifəsində çalışmışdır.

S.F.Abdullayev İkinci Qarabağ müharibəsi zamanı Füzuli, Qubadlı, Daşaltı, Şuşa istiqamətində gedən döyüşlərdə iştirak etmişdir. Noyabr ayının 6-da Şuşada yaralanmışdır.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Cəsur döyüşçü", "Füzuli, Qubadlı və Şuşanın" azad olunmasına görə medallarıyla təltif edilmişdir.

## Toğrul İmran oğlu MUSAYEV

5 fevral 1997-ci ildə Şəki rayonunun Cumakənd kəndində anadan olmuşdur. 2003-2014-cü illərdə Cumakənd tam orta məktəbində təhsil almışdır. 2015-2016-cı illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

Kiçik çavuş T.İ.Musayev "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmış, Suqovuşan, Talışkənd, Kəlbəcər istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Suqovuşanın azad olunmasına görə" medalıyla təltif edilmişdir.

## Qafur Namiq oğlu ŞƏRİFOV

28 aprel 1997-ci ildə Şəki rayonunun Cumakənd kəndində anadan olmuşdur. 2003-2014-cü illərdə Cumakənd tam orta məktəbində təhsil almışdır. 2015-2016-cı illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

Q.N.Şərifov "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmış, Tərtər, Ağdam, Ağdərə istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Suqovuşanın azad olunmasına görə" medalıyla təltif edilmişdir.

## Vüqar Məsim oğlu İMAMOV

1 may 1997-ci ildə Şəki rayonunun Cumakənd kəndində anadan olmuşdur. 2004-2015-ci illərdə Cumakənd tam orta məktəbində təhsil almışdır. 2015-2017-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

V.M.İmamov "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmış, Laçında yerləşmiş təminat bölüyündə sürücü kimi xidmət etmişdir.

**Leytenant**
**Elnur Bünyamin oğlu QULİYEV**

28 sentyabr 1997-ci ildə Şəki rayonunun Cumakənd kəndində anadan olmuşdur. 2004-2013-cü illərdə Cumakənd tam orta məktəbində, 2013-2016-cı illərdə Cəmşid Naxçıvanski adına Hərbi Liseydə, 2016-2020-ci illərdə isə Heydər Əliyev adına Ali Hərbi Məktəbdə təhsil almışdır. 2020-ci il aprel ayının 19-dan Azərbaycan Respublikası Müdafiə nazirinin əmrinə əsasən N saylı Hərbi hissədə xidmətə başlamışdır.

Leytenant E.B.Quliyev İkinci Qarabağ müharibəsi zamanı Cəbrayıl və Qubadlı istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Cəbrayılın azad olunmasına görə" medalıyla təltif edilmişdir.

## Emil Mahir oğlu ŞƏRİFOV

23 may 1998-ci ildə Şəki rayonunun Cumakənd kəndində anadan olmuşdur. 2004-2015-ci ildə Cumakənd tam orta məktəbində təhsil almışdır. 2016-2018-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

E.M.Şərifov "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmış, Tovuz, Qubadlı, Cəbrayıl, Zəngilan istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Qubadlı və Zəngilanın azad olunmasına görə" medallarıyla təltif edilmişdir.

**Nail Səfa oğlu**
**XƏLİLOV**



19 oktyabr 1998-ci ildə Şəki rayonunun Cumakənd kəndində anadan olmuşdur. 2005-2016-cı illərdə Cumakənd tam orta məktəbində təhsil almışdır. 2016-2018-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

N.S.Xəlilov "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı" ilə ikinci Qarabağ müharibəsinə qatılmış, Tərtər, Ağdam, Füzuli, Xocavənd, Cəbrayıl və Qubadlı istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Suqovuşanın azad olunmasına görə" medalıyla təltif edilmişdir.

Hal-hazırda Cumakənddə diş texniki kimi fəaliyyət göstərir.



**Rizvan Hamlet oğlu İSMAYILOV**

14 aprel 1999-cu ildə Şəki rayonunun Cumakənd kəndində anadan olmuşdur. 2006-2017-ci illərdə Cumakənd tam orta məktəbində təhsil almışdır. 2017-2018-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

R.H.İsmayılov “Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı” ilə İkinci Qarabağ müharibəsinə qatılmış və Füzuli, Qubadlı, Cəbrayıl, Daşaltı, Şuşa istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə “Füzulinin və Şuşanın azad olunmasına görə” medalları ilə təltif edilmişdir.

## Murad Tərlan oğlu YUSİFOV

20 yanvar 2000-ci ildə Şəki rayonunun Cumakənd kəndində anadan olmuşdur. 2007-2018-ci illərdə Cumakənd tam orta məktəbində təhsil almışdır. 2018-2019-cu illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

M.T.Yusifov "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmış və Şuşa, Laçın istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Şuşanın azad olunmasına görə" medalıyla təltif edilmişdir. Hal-hazırda Azərbaycan Respublikası Daxili İşlər Nazirliyi, Daxili Qaşunlarda müddətdən artıq xidmətini davam etdirir.

## Xəyyam Tağı oğlu MƏMMƏDOV (Qazi)

16 fevral 2000-ci ildə Şəki rayonunun Cumakənd kəndində anadan olmuşdur. 2006-2017-ci illərdə Cumakənd tam orta məktəbində təhsil almışdır. 2018-2019-cu illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

Müddətdən artıq hərbi xidmətdə olan X.T.Məmmədov İkinci Qarabağ müharibəsi zamanı Füzuli, Cəbrayıl, Xocavənd, Qubadlı, Zəngilan, Laçın və Şuşa istiqamətində gedən döyüş-lərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Koman-dan İlham Əliyevin Sərəncamı ilə "Füzuli, Cəbrayıl, Xocavənd, Qubadlı, Zəngilan və Laçının azad olunmasına görə" medalla-rıyla təltif edilmişdir.

**Mürşüd Mahir oğlu HÜSEYNƏLİYEV**



15 aprel 2001-ci ildə Şəki rayonunun Cumakənd kəndində anadan olmuşdur. 2007-2018-ci illərdə Cumakənd tam orta məktəbində təhsil almışdır. 2019-2021-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur. Xidməti dövrü İkinci Qarabağ müharibəsinə təsadüf etdiyindən o, Füzuli, Şuşa, Xocavənd, Hadrut və Laçın dəhlizi istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Füzuli, Şuşa və Xocavəndin azad olunmasına görə" medallarıyla təltif edilmişdir.



**Kamal Camal oğlu SALAHOV**

16 may 2002-ci ildə Şəki rayonunun Cumakənd kəndində anadan olmuşdur. 2008-2019-cu illərdə Cumakənd tam orta məktəbində təhsil almışdır. 2020-ci ilin iyulundan həqiqi-hərbi xidmətdədir.

Əsgər K.C.Salahov İkinci Qarabağ müharibəsi zamanı Murovdağ-Kəlbəcər istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Kəlbəcərin azad olunmasına görə" medalıyla təltif edilmişdir.

## Xəyal Nazim oğlu MAHMUDOV

30 avqust 2000-ci ildə Şəki rayonunun Cumakənd kəndində anadan olmuşdur. 2006-2017-ci illərdə Cumakənd tam orta məktəbində təhsil almışdır. 2018-2020-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

X.N.Mahmudov "Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı" ilə İkinci Qarabağ müharibəsinə qatılmış , Cəbrayıl, Qubadlı və Laçın istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə "Cəbrayıl, Qubadlı və Laçının azad olunmasına görə" medallarıyla təltif edilmişdir.



**Onur Eldar oğlu**
**BƏKİROV**

3 oktyabr 2000-ci ildə Şəki rayonunun Cumakənd kəndində anadan olmuşdur. 2007-2018-ci illərdə Cumakənd tam orta məktəbində təhsil almışdır. 2016-2018-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur.

O.E.Bəkirov “Azərbaycan Respublikasında qismən səfərbərlik elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 28 sentyabr 2020-ci il tarixli Sərəncamı” ilə İkinci Qarabağ müharibəsinə qatılmış və Suqovuşan, Ağdərə istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə “Suqovuşanın azad olunmasına görə” medalıyla təltif edilmişdir.

Hal-hazırda Bakı şəhərində diş texniki kimi fəaliyyət göstərir.

## Vüsal Vüqar oğlu ABBASOV

28 sentyabr 2001-ci ildə Şəki rayonunun Cumakənd kəndində anadan olmuşdur. 2007-2008-ci illərdə Cumakənd tam orta məktəbində təhsil almışdır. 2019-2021-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur. İkinci Qarabağ müharibəsi zamanı Füzuli, Xocavənd, Cəbrayıl, Zəngilan və Şuşa istiqamətində gedən döyüşlərdə iştirak etmışdir.

Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə “Füzulinin və Cəbrayılın azad olunmasına görə” medallariyla təltif edilmişdir.



**Vahid Şərif oğlu**
**ABDULLAYEV**

5 noyabr 2001-ci ildə Şəki rayonunun Cumakənd kəndində anadan olmuşdur. 2008-2019-cu illərdə Cumakənd tam orta məktəbində təhsil almışdır. 2020-2021-ci illərdə həqiqi-hərbi xidmətdə olmuşdur. İkinci Qarabağ müharibəsi zamanı Füzuli, Xocavənd, Cəbrayıl və Qubadlı istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

V.Ş.Abdullayev Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin Sərəncamı ilə “Füzulinin və Xocavəndin azad olunmasına görə” medallarıyla təltif edilmişdir

***Aqşin İbrahimxəlilov***



## VƏTƏN ƏRLƏRİ

*Vətən bizi səsləyir,Vətən yenə dardadır,*
*İllərdir əsir olan torpağımız inləyir*
*Yağı düşmən əlindən,*
*Acı hicran əlindən:*
*"Suyumu,çörəyimi,havamı daddırdığım övladlarım hardadır?!*
*Kim ki məni dinləyir,*
*Kim ki mənimlə birgə acı çəkir,çırpınır,*
*Gəlsin,qurtarsın məni qara zindan əlindən!"*

*Qalxdı ayağa ərlər,hamı bir nəfər kimi,*
*Vətən sərhədlərinə düzülüb sipər kimi*
*Onlar tarixə düşdü, onlar igid oldular.*
*Ayıq-sayıq, ayaqda durdular, sədd oldular,*
*Düşüb ana torpağa bəzən şəhid oldular,*
*Şəhidlik zirvəsilə yenə sərhəd oldular.*
*"Vətənə qurban olum" deyib, düzələn yola,*

*Kimi gözünü verdi, kimisi ayağını.*
*Dişlərilə vuruşdu, qolunu itirənlər:*
*- Vətənə qurban ola.*
*Çaş-baş qaldı, təlaşla baxaraq sağa-sola,*
*Harınlamış, qudurmuş,*
*Yolunu itirənlər!*

*Vətəninə kəc baxan hər yağını, düşməni,*
*Vətənin göylərində,*
*Süzə-süzə əzdilər,*
*Vətənin sularında*
*Üzə-üzə əzdilər.*
*Vətənin torpağında qarış-qarış, yerbəyer,*
*Gəzə-gəzə əzdilər,*
*Əzə-əzə gəzdilər...*

*Torpaqdan güc alaraq havaya qartal kimi*
*Qalxdı igidim, ərim,*
*Göylərdən ilham alıb*
*Şığıdılar yerlərə deyərək "Allah Kərim".*
*Torpağı öpə-öpə,*
*Quca-quca uçdular,*
*Uça-uça qucdular...*

*Qorxuda bildi sizi nə güllə, nə xof, hədə,*
*Canınız, qanınızla məhv etdiniz yadları.*
*Borcunuz qaytarılmaz dünyalar verilsə də,*
*Haqqınız da ödənməz, ey Vətən övladları.*

## SON SÖZ ƏVƏZİ

Əziz oxucu, bir illik araşdırmanın sonu olaraq "Göynük qartalları İkinci Qarabağ müharibəsində" kitabımız maliyyə çətinliklərinə baxmayaraq işıq üzü gördü.

Yaradıcı insan üçün aşılması çətin olan bir sədd var: parası olub kafası xeyirxahlıq üçün çalışmayan birisinə ağız açmaq. Bunu anlamaq üçün bizim yerimizdə olmaq gərəkdir.

Nə isə, bütün çətinliklər arxada qaldı. Bu böyüklükdə yükün altında boğulacağımızı düşünənlərin də olduğunu zənn edirik və onların arzularının ürəklərində qaldığına görə də pərişanıq. Amma nə edək, biz beləyik. Başladığımız hər hansı bir layihəni şəxsi zərərimizə olsa belə, sona çatdırmaq prinsipimizdir. Vətənimizin erməni quldurları tərəfindən işğal edilmiş torpaqlarının azadlığa qovuşmasında canlarından keçən oğullarımızın etdiklərinin yanında bizimki heç nədir. Var-dövlət, mal-mülk o oğulların bir qara telinə qurban olsun. Sadəcə bunu anlamaq lazımdır. Şükür olsun allaha ki, biz bunu anlayanların sırasındayıq. Və ona da şükür olsun ki, soydaşlarımızın içərisində bunu anlayanların sayı kifayət qədər çoxdur.

Əziz oxucu, kitabımızda iki yüzdən çox İkinci Qarabağ müharibəsi iştirakçısı barədə məlumat öz əksini tapmışdır. Təbii ki, bu məlumatların əldə edilməsində bizə köməyi keçənlər çox olmuşdur. Ad çəkmədən onların hər birinə təşəkkürümüzü bildiririk.

Yuxarıda qeyd etdik ki, maliyyə çətinliklərinə baxmayaraq kitabımız işıq üzü gördü. Bu məsələdə də bizə kömək edənlər oldu. Onların köməyi kitabın bütün xərcini ödəməyə kifayət etməsə də, imkanları daxilində addım atdılar. Bu mənada onların adlarını çəkmək istəyirik, ona görə ki, başqaları onlardan

örnək götürsünlər. Məmmədəli Məmmədov, İslam Salmanov, Yadigar Abdulkərimov, Yaşar Ataşov, Şahid İsmayılov, Seyidəli Abdullayev kimi dostlarımız kitabın tarixi əhəmiyyətini qiymətləndirməyi bacardıqları üçün ilk gündən bu məsələdə yanımızda oldular.

Yanımızda olmaq istəyi ürəyindən keçənlərin də çox olduğuna inanırıq. Allah hamıdan razı olsun. Gəlin torpaq uğrunda canlarından keçən, bədəninin bir üzvünü itirərək əlil olan və ya təsadüf nəticəsində sağ qalan övladlarımızı gələcəyimiz naminə heç zaman unutmayaq və unutmağa qoymayaq. Axı onların hər biri bizim qəhrəmanımızdır!

## MÜNDƏRİCAT

AŞAĞI GÖYNÜK

**Ş Ə H İ D L Ə R**



AŞAĞI GÖYNÜK

**Ş A H İ D L Ə R**

BAŞ LAYISQI

(Cunud, Qumux, Şin)

**Ş A H İ D L Ə R**

CUMAKƏND

**Ş A H İ D L Ə R**

**Kitabı tərtib etdilər:**
Şahin Aydəmir,
Osman Məmmədov,
İlkin İbrahimxəlilov

**GÖYNÜK QARTALLARI**
İKİNCİ QARABAĞ MÜHARİBƏSİNDƏ

Yığlmağa verilmişdir: 12.07.2021
Çapa imzalanmışdır: 14.09.2021
Tiraj 1000, şərti çap vərəqi 19

**“Zəngəzurda” çap evi**
mətbəəsində çap olunmuşdur